DOI: https://doi.org/10.36719/2706-6185/31/5-9

**Arzu Xəlilzadə**
Bakı Dövlət Universiteti
tarix üzrə fəlsəfə doktoru
arzuxelilzade89@gmail.com

# AZƏRBAYCANDA YÜNGÜL VƏ YEYİNTİ SƏNAYESİNİN İNKİŞAFI: ƏRZAQ TƏHLÜKƏSİZLİYİ PROBLEMLƏRİ

**Xülasə**

Azərbaycan Respublikasında neft sənayesi ilə yanaşı, qeyri-neft sektorunun inkişafı istiqamətində müəyyən addımlar atılır. Azərbaycan neft və qazın ixracından əldə edilən gəlirləri iqtisadiyyatın digər sahələrinə yönəldərək şaxələndirmə siyasətinə üstünlük verir. Bu baxımdan Azərbaycanda tələbat duyulan əsas sahələrdən biri yüngül və yeyinti sənayesinin inkişaf etdirilməsi dövlətin qarşısında mühüm vəzifələr qoyur. Azərbaycan işğaldan azad olunmuş ərazilərdə yüngül və yeyinti sənayesinin inkişafını və bu sahədə dünya təcrübəsinin tətbiq edilməsini əsas vəzifələrdən biri kimi müəyyənləşdirmişdir.

Məqalədə 2003-cü ildən etibarən Azərbaycanda yüngül və yeyinti sənayesinin inkişaf dinamikası izlənilmişdir. Tədqiq edilən dövrdə yüngül və yeyinti sənayesində əsas problemlər, inkişafa mane olan amillər, bu məhdudiyyətlərin aradan qaldırılması istiqamətində həyata keçirilən islahatlar göstərilmişdir. Müəllif göstərmişdir ki, kənd təsərrüfatı sahəsində bir sıra maneələrin aradan qaldırılması Azərbaycanda yeyinti sənayesinin inkişafına və əhalinin ərzaq təhlükəsizliyinin təmin edilməsinə xidmət edir.

***Açar sözlər:*** *Azərbaycan, yüngül sənaye, yeyinti sənayesi, ərzaq təhlükəsizliyi, kənd təsərrüfatı, toxuculuq*

**Arzu Khalilzade**
Baku State University
doctor of philosophy in history
arzuxelilzade89@gmail.com

## Development of the light and food industry in Azerbaijan: problems of food safety

**Abstract**

Along with the oil industry, certain steps are being taken in the development of the non-oil sector in the Republic of Azerbaijan. Azerbaijan prefers a policy of diversification, directing revenues from the export of oil and gas to other sectors of the economy. From this point of view, the development of the light and food industry, one of the main areas in demand in Azerbaijan, poses important tasks for the state. Azerbaijan has identified the development of the light and food industry in the liberated territories and the application of world experience in this area as one of the main tasks.

In the article, since 2003, the development dynamics of the light and food industry in Azerbaijan have been followed. In the studied period, the main problems in the light and food industry, the factors hindering development, and the reforms carried out in the direction of eliminating these restrictions are shown. The author has shown that the elimination of a number of obstacles in the field of agriculture serves the development of the food industry in Azerbaijan and ensuring the food security of the population.

***Keywords:*** *Azerbaijan, light industry, food industry, food safety, agriculture, textile*

## Giriş

Azərbaycan dövlət müstəqilliyini bərpa etdikdən sonra neft sənayesinin inkişafından və enerji ixracatından əldə edilən gəlirlər qeyri-neft sektorunun, eləcə də yüngül və yeyinti sənayesinin inkişafına yönəldildi. Yüngül sənaye ilk növbədə toxuculuq, xəz-dəri, gön-dəri, ayaqqabı, trikotaj və xalçaçılıq sahələrinin inkişafını əhatə edir. Yüngül sənaye sahəsi onu xammalla, yəni pambıq, kətan, heyvandarlıq məhsulu ilə təmin edən yun, ipək, xəz-dəri, süni və sintetik liftlər verən kimya sənayesi ilə sıx əlaqədardır. Yüngül sənaye eyni zamanda əhalini məişət əşyaları ilə təmin edən sahələrdən ibarətdir. Bu sənaye sahəsi kənd təsərrüfatı, maşınqayırma sənayesi ilə də sıx bağlıdır. Kənd təsərrüfatı yüngül sənayeni müxtəlif xammal növləri ilə, maşınqayırma – avadanlıqlarla, kimya sənayesi isə liflərlə və boyalarla təmin edir. Azərbaycanın yüngül sənayesi əsasən pambıq, yun, barama və gön-dəri xammalı məhsullarının emalına əsaslanır.

Azərbaycanda yüngül sənayenin inkişafının tarixi qədimdir. Bu sahənin, xüsusilə Azərbaycanda xalçaçılığın inkişafı XIII əsrə əsaslanır.

Azərbaycanda yüngül sənayedə əsas istiqamətlərdən biri toxuculuq idi. Ən iri toxuculuq fabriki 1897-ci ildə Zeynalabdin Tağıyev tərəfindən yaradılmış və “Tağıyevin Qafqaz Səhmdar Cəmiyyəti lifli məmulatlar emal edən fabrik” adı altında fəaliyyətini davam etdirmişdir. 1827-ci ildə Nuxa ipəkçilik manufakturası cəmiyyəti, bir qədər sonra 1829-cu ildə Şəkidə Xanabad ipəkçilik məktəbi fəaliyyətə başlamış, Xanabad ipək müəssisəsi tikilməklə bu fabrikin əsası qoyulmuşdur (Abbasov, Əliyev, 2018: 111-125).

Azərbaycanda tarixən yüngül sənaye müəssisələri olub və bu sahə ölkə üçün ənənəvi sahəyə çevrilib. SSRİ zamanında Azərbaycanda pambığın ilkin emalından tutmuş, ondan hazır məhsul istehsalına qədər texnoloji prosesi özündə cəmləşdirən kompleks müəssisələr mövcud idi.

Müstəqilliyin ilk illərində aparılan iqtisadi islahatlar nəticəsində mövcud olan yüngül sənaye müəssisələrinin əksəriyyəti fəaliyyətini dayandırdı. Bunun əsas səbəbi həmin müəssisələrin özəlləşdirildikdən sonra onların bir çoxlarının yeni şəraitdə fəaliyyət göstərə bilməməsi idi. Buna görə də 1990-2005-ci illərdə iqtisadiyyatda məhz yüngül sənayedə ciddi geriləmələr baş verdi (2).

Yüngül sənayenin inkişafı eyni zamanda ölkənin idxalına təsir göstərir və onun azalması ilə nəticələnir. Yüngül sənaye sahəsində toxuculuq, geyim, xalçaçılıq, dəri və dəri məmulatları, xəz və xəz məmulatları və ayaqqabı istehsalının artması mühüm idi. Hər il Azərbaycanda əhali bu növ məhsullara milyardlarla manat vəsait xərcləyirdi. 2015-ci ilin məlumatına əsasən, Azərbaycanda əhali bir ildə trikotaj məmulatlarına 651 milyon manat, baş geyimlərinə 14 milyon manat, xəz və xəz məmulatlarına 19,5 milyon manat və geyimlərə 451 milyon manat vəsait xərcləyib (2). Göründüyü kimi, ildən-ilə yüngül sənaye mallarına tələbat artmışdır. Yerli istehsalın zəif olması səbəbindən hər il xaricdən yüz milyonlarla dollar dəyərində yüngül sənaye məhsulu gətirilirdi.

Azərbaycanda yüngül sənaye sahəsi inkişaf etsə də, çoxsaylı müəssisələr yaradılsa da, yüngül sənaye mallarına olan daxili tələbatın 90 faizi idxal hesabına ödənilirdi. Azərbaycana yüngül sənaye məhsulları, xüsusilə geyim malları xaricdən – Türkiyə, İran, Çin və bəzi Avropa ölkələrindən gətirilirdi (3).

Eyni zamanda yüngül sənaye sahəsində investisiyaların stimullaşdırılması da vacib idi.

Azərbaycanda yüngül sənayenin əsas xammal bazası pambıqçılıq hesab edilir. Yüngül sənayenin ixrac imkanlarının artırılması məqsədilə hökumət tərəfindən ciddi tədbirlər görülməyə başlanılmışdı. 2013-cü ildən başlayaraq Azərbaycanda 10-a yaxın yüngül sənaye müəssisəsi yaradılmış, 2016-cı ildən isə pambıqçılığın inkişafına dövlət dəstəyi artırılmışdır (4). Həmin dövrdən etibarən Azərbaycanda qeyri-neft sektorunun, yüngül sənayenin inkişafı istiqamətində mühüm addımlar atılmış, yüzlərlə sənaye müəssisəsi inşa edilmiş, bu sahədə güclü potensial yaradılmışdır (2).

Araşdırılan illərdə 50-dən çox kiçik pambıqtəmizləmə müəssisəsi olsa da, onların ən böyükləri yalnız Bakı, Gəncə və Mingəçevirdə mövcud idi. Ölkədə müasir tipli 14 pambıqtəmizləmə zavodu var idi. Bunlar əsasən Ağcabədi, Yevlax, Dəliməmmədli, Ləki, Daşburun, Bərdə, Ucar, Sabirabad, Tərtər, Şirvan, İmişli, Salyan, Sarıcallar, Horadiz zavodları idi. Ölkədə kifayət qədər xammalın olmasına baxmayaraq, yun mallarına əsaslanan toxuculuq zəif inkişaf etmiş və bu sahədə yalnız

xalçaçılıq üstünlük təşkil etmişdir. Yun istehsalı 1940-cı ildə 4,2 min ton, 1980-ci ildə 10,7 min ton olmuşdusa, 2000-ci ildə bu rəqəm 10,9 min ton olmuş və 2015-cü ildə isə 15,6 min ton yun istehsal edilmişdir (Abbasov, Əliyev, 2018: 111-125).

Tədqiq edilən illərdə Azərbaycanda kənd təsərrüfatının inkişafına diqqət yetirilmişdir. Azərbaycan kənd təsərrüfatının inkişafı baxımından, həmçinin bitki örtüyünün müxtəlifliyinə görə dünyanın ən zəngin dövlətlərindən biridir.

XX əsrin 90-cı illərin əvvəllərində aqrar sahənin xüsusi çəkisi ümumi daxili məhsulun strukturunda 19,5 faiz təşkil edirdi. Azərbaycanda aqrar sahədə əsaslı dəyişikliklər 1996-cı ildən başlamış, istehsal olunan məhsulların qiymətləri liberallaşdırılmışdır.

Bu dövrdə kənd təsərrüfatı sahəsində texniki yeniliklərə ehtiyac var idi. Dövlət təsərrüfatlarından və kolxozlardan miras qalmış əmlak yararsız və ya qismən yararlı halda idi (6).

XX əsrin 90-cı illərində Azərbaycanda kənd təsərrüfatı sahəsində əsas problemlərdən biri kifayət qədər taxıl istehsal edilməməsi, ən mühüm məsələlərdən biri əhalinin çörəklə təminatı idi. Bu dövrdə Rusiya, Türkiyə və İranla aparılan danışıqlar, eləcə də daxili islahatlar nəticəsində ölkənin taxıl və una olan ehtiyacı ödənildi.

Azərbaycan torpaq ehtiyatları məhdud olan ölkələr sırasına aiddir. Tədqiq olunan illərdə Azərbaycanın 8,64 milyon hektar təşkil edən ümumi ərazisinin 55 faizi və ya 4,74 milyon hektarı kənd təsərrüfatı təyinatlı torpaqlar idi. Kənd təsərrüfatına yararlı ərazilərin təqribən 1,8 milyon hektarı əkin sahələri idi. Bu sahələrin 181,6 min hektarı uzun müddət Ermənistanın işğal altında olmuşdur.

Su problemi kənd təsərrüfatının inkişafına mane olan amillərdən idi. Azərbaycan arid zonada yerləşdiyindən su ehtiyatları məhduddur. Onun yerüstü su ehtiyatları 32,2 milyard kub metr təşkil edir və quraqlıq illərdə bu göstərici 22,6 milyard kub metrə qədər azalır.

Bu problemlərin aradan qaldırılması üçün Azərbaycanda meliorasiya – irriqasiya sisteminin yenidən qurulması və təkmilləşdirilməsi istiqamətində mühüm addımlar atılmış, irimiqyaslı layihələr həyata keçirilmişdir. Əkin sahələrinin və əhalinin içməli suya olan tələbatının ödənilməsi üçün 2004-2015-ci illər ərzində 1492 ədəd subartezian quyusu qazılmışdır. “Samur-Abşeron suvarma sisteminin yenidən qurulması” layihəsi çərçivəsində Taxtakörpü su anbarı və “Şəmkirçay çayı üzərində dəryaçanın tikintisi” layihəsi çərçivəsində Şəmkirçay su anbarı və ümumi sututumu 165 milyon kub metr və ümumi uzunluğu 60,6 km olan magistral kanallar tikilib istifadəyə verilmişdir. Bununla belə, texnika parkındakı yeni alınan maşın və avadanlıqların sayı artsa da, istismar müddəti başa çatan texnikaların yeniləri ilə əvəz edilməsinə ehtiyac var idi.

Kənd təsərrüfatı məhsullarının həm ölkə daxilində, həm də ixrac bazarlarına daşınması ilə bağlı bəzi maneələr mövcud idi. Belə ki, daşıma xidmətləri göstərənlər ucqar kəndlərdən, xüsusilə də yolları təmirsiz olan kəndlərdən nisbətən yüksək daşıma haqqı tələb edilirdi. Ümumilikdə isə kənd təsərrüfatı məhsulları üzrə bazar infrastrukturunun inkişafı lazımi səviyyəyə çatmadığından, kənd təsərrüfatı məhsullarının daşınmasında müvafiq keyfiyyət tələbləri kifayət qədər nəzərə alınmırdı (Zeynalov, 2019: 95).

Bu sahədə aparılmış islahatlar nəticəsində aqrar-sənaye kompleksini inkişaf etdirmək, ərzaq təhlükəsizliyini təmin etmək üçün qanunvericilik bazası yaradılmış, özəlləşdirilən təsərrüfatlar əsasında 1191 kollektiv, 156 kənd təsərrüfatı istehsalı kooperativləri, 2651 ailə-kəndli təsərrüfatı və digər özəl qurumlar yaradılmış, 1999-cu ildən etibarən, kənd təsərrüfatı məhsulları istehsalçıları torpaq vergisi istisna olmaqla, bütün vergilərdən azad edilmiş, Dünya Bankı, Beynəlxalq İnkişaf Assosiasiyası və BMT-nin Ərzaq və Kənd Təsərrüfatı Təşkilatının dəstəyi ilə aqrar sahədə ümumi dəyəri 158 milyon dollar olan mühüm layihələr həyata keçirilmiş, taxıl əkinlərinə görə subsidiyaların verilməsinə başlanılmış, texniki təminatın yaxşılaşdırılması üçün “Aqrolizinq” Açıq Səhmdar Cəmiyyəti yaradılmış, istehsalçılara güzəştli şərtlər əsasında texnika və gübrələr verilmiş, kənd təsərrüfatı məhsulları istehsalında özəl bölmənin xüsusi çəkisi 99,7 faizə çatmışdır (8).

Kənd təsərrüfatı və ərzaq məhsulları ixracının həcmi 2001-2015-ci illər ərzində 11,1 dəfə, 2005-2015-ci illər ərzində isə 2,2 dəfə artmışdır. Bununla belə, ilkin kənd təsərrüfatı məhsullarının ixrac coğrafiyası çox məhdud idi. Belə ki, bu məhsulların 90 faizi Baltikyanı dövlətlər istisna olmaqla,

postsovet ölkələrinə, xüsusilə Rusiyaya ixrac olunurdu. Azərbaycanda istehsal olunan kənd təsərrüfatı məhsullarının əsas ixrac bazarı Rusiya idi (Zeynalov, 2019: 95).

Kənd təsərrüfatının inkişafına dair Strateji Yol Xəritəsinə əsasən, 2020-ci ildə Azərbaycan dövlətinin qarşısında kənd təsərrüfatının inkişafı ilə əlaqədar bir sıra prioritetlər dayanırdı. Daxili və xarici bazarda rəqabətqabiliyyətli kənd təsərrüfatı və emal sənayesi məhsulları üzrə istehsal potensialının gücləndirilməsi, kompleks layihələrin həyata keçirilməsi üçün dövlət-özəl tərəfdaşlığının inkişafı, aqrobiznesin inkişafına dəstək, kənd təsərrüfatı sahəsi üzrə maliyyələşdirmə mexanizmlərinin təkmilləşdirilməsi, ekoloji təmiz kənd təsərrüfatı istehsalının inkişaf etdirilməsi prioritetlər olaraq müəyyənləşdirilmişdi (Zeynalov, 2019: 95).

Tədqiq olunan illərdə kənd təsərrüfatı sahəsində müəyyən problemlər də var idi. Kiçik torpaq sahibliyi və kiçik təsərrüfatlar kənd təsərrüfatının rəqabətqabiliyyətliliyinin artmasına mane olan problemlər içərisində əsas yer tuturdu. Kiçik təsərrüfatların təşkilatlanmasının qənaətbəxş olmaması, həm resurslara olan tələbatın təmin edilməsində, həm də bazara çıxmaqda çətinliklər yaradırdı.

Kiçik kənd təsərrüfatı məhsulları istehsalçıları arasında təşkilatlanma aşağı səviyyədə idi. Bu da onların dövlətin aqrar siyasətinin formalaşmasında zəif iştirak etməsinə səbəb olurdu. Kənd təsərrüfatı istehsalçılarının könüllü şəkildə müxtəlif sahəvi və regional assosiasiyalarda birləşməsi təcrübəsi də mövcud deyildi. Bununla belə kənd təsərrüfatında kiçik və orta sahibkarlığın inkişafı məqsədi ilə müxtəlif tədbirlər görülmuş, Kənd Təsərrüfatı Nazirliyi yanında Kənd Təsərrüfatı Layihələri və Kreditlərinin İdarə Edilməsi üzrə Dövlət Xidməti 2006-cı ildən etibarən bu sahəyə güzəştli kreditlər ayırmağa başlamışdır. 2005-2015-ci illər ərzində Sahibkarlığa Kömək Milli Fondu vasitəsi ilə kənd təsərrüfatı məhsullarının istehsalı və emalı sahələrinə ayrılmış güzəştli kreditlərin həcmi 18,1 dəfə artmışdır (Zeynalov, 2019: 95).

2020-ci il quraqlıqla müşayiət olunsa da, Azərbaycanda kənd təsərrüfatında müsbət inkişaf dinamikası davam etmiş, ölkədə taxıl istehsalı 31,2 sentner təşkil etmiş, bir çox rayonlarda məhsuldarlıq 40 sentnerdən artıq olmuşdur. 2019-cu illə müqayisədə ölkədə 2,5 faiz çox tərəvəz, 4,2 faiz çox meyvə və giləmeyvə, 15 faizdən çox tütün, 2,1 faiz çox kartof istehsal edilmişdir. Həmin il pambıq sahəsində yüksək məhsuldarlıq əldə olunaraq 100 min hektar pambıq sahəsindən 335 min tondan çox məhsul əldə edilmişdir. Eyni zamanda heyvandarlıq təsərrüfatında da müsbət inkişaf dinamikası olmuş, ət istehsalında 3,1 faiz artım, süd istehsalında isə 1,7 faiz artım əldə edilmişdir. Kənd təsərrüfatının inkişaf etdirilməsi üçün əsas məqsədlərdən biri kənd təsərrüfatının ixracı istiqamətlərinin və məhsulların çeşidinin artırılması olmuşdur (9).

Həyata keçirilən təşkilati tədbirlərdən biri iri özəl taxılçılıq təsərrüfatlarının yaradılması idi. Azərbaycanda aqrar sənaye məhsulları, xüsusilə qida, içki və tütün həcminə görə emal sənayesi sahələri içərisində birinci yeri tuturdu. 2015-ci ildə qida, tütün məhsulları və içki istehsalı milyard manata çatmış, 2005-ci illə müqayisədə 2,3 dəfə artmışdır (Abbasov, Əliyev, 2018: 94-100).

Tədqiqat göstərir ki, kənd təsərrüfatının mühüm sahəsi olan heyvandarlıq inkişaf edirdi. Heyvandarlığın intensiv inkişaf etdirilməsində mühüm rol oynayan süni mayalama tədbirləri ildən-ilə genişlənirdi. Cənubi Qafqazda ilk dəfə olaraq Azərbaycanda süni mayalanma mərkəzi fəaliyyət göstərmişdir.

İkinci Qarabağ müharibəsinin baş verməsi işğaldan azad edilən ərazilərdə aqrar sektorun inkişafını və həmin regionların ərzaq təhlükəsizliyinin təmin edilməsini yeni vəzifələr kimi müəyyənləşdirmişdir. İşğaldan azad edilmiş ərazilərdə üzümçülük və taxılçılığın inkişafı üçün böyük potensial vardır. Ermənistan işğal zamanı uzun müddət bu torpaqların potensialından istifadə etmiş, 1200 hektar üzüm bağından qanunsuz yollarla məhsul götürmuşdür. İşğal edilmiş ərazilərdə böyük taxıl sahələri var. Ermənistan bu torpaqlardan 90 min hektardan çox taxıl götürürdü (9).

İşğaldan azad edilmiş ərazilərdə kənd təsərrüfatının inkişaf etdirilməsi ilə bağlı işlərə başlanılmış, faktiki əkinə yararlı torpaqların peyk təsvirləri əsasında xəritələşməsi aparılmışdır. Azərbaycan Prezidenti İlham Əliyev bu ərazilərdə kənd təsərrüfatının inkişafı və ərzaq təhlükəsizliyinin təmin edilməsi üçün prioritetlərin müəyyənləşdirilməsinin vacib olduğunu bildirmişdir (9).

Müasir yüksək texnoloji inkişaf kənd təsərrüfatında da mövcuddur və Azərbaycan bu yeniliklərə və tendensiyalara uyğunlaşmaq imkanlarından istifadə edir. Kənd təsərrüfatı sahəsi qlobal səviyyədə "Yaşıl inqilab" mərhələsindən "İkinci yaşıl inqilab" və ya "Biotexnologiya inqilabı" mərhələsinə keçid dövrünü yaşayır. Bu amil dayanıqlı kənd təsərrüfatı istehsalına imkan verən yeni texnologiyaların tətbiqinin genişləndirilməsini zəruri etmişdir. Məhz buna görə də biotexnologiya müasir dövrdə qlobal ərzaq təhlükəsizliyinin köklü şəkildə gücləndirilməsi və ətraf mühitə mənfi təsirlərin azaldılması vasitəsi kimi çıxış edir. 2050-ci ildə dünya əhalisinin 9,3 milyard nəfərə qədər artacağı və onun qidalanması üçün tələb olunan ümumi ərzaq istehsalının 70 faiz artırılmasına ehtiyac yaranacağı proqnozlaşdırılır (Zeynalov, 2019: 95). Qlobal dünyanın bir hissəsi olan Azərbaycana bu proseslərin təsirsiz ötüşməyəcəyi şübhəsizdir.

## Nəticə

Tədqiqat göstərir ki, Azərbaycanın inkişaf etməkdə olan qeyri-neft sahələrindən biri yüngül və yeyinti sənayesi idi. Yüngül sənaye ən mühüm tələbatlı sahələrdən biri olmuşdur. XX əsrin 90-cı illərindən etibarən Azərbaycanda yüngül sənaye müəssisələri yaradılsa da, respublikada idxaldan asılılıq mövcud idi. Bu sahəyə investisiya qoyuluşunun azlığı yüngül sənayenin inkişafına mane olan amillərdən idi.

Yeyinti sənayesi sahəsində kənd təsərrüfatı məhsullarının istehsalı əhəmiyyətli idi. Kənd təsərrüfatının inkişafı üçün torpaq ehtiyatlarının olması vacib idi. Lakin Azərbaycanda torpaq ehtiyatlarının azlığı və su çatışmazlığı, texnikanın zəifliyi kənd təsərrüfatının inkişafına mane olurdu. Bununla belə tədqiq olunan illərdə kənd təsərrüfatının, yeyinti sənayesinin inkişafı üçün nəzəri-konseptual baza yaradılmış, islahatlar həyata keçirilmiş və dünyada bir sıra dövlətlərin nümunəsində yaşıl iqtisadiyyata keçid əsas vəzifə olaraq müəyyənləşdirilmişdir.

## Ədəbiyyat

1. Abbasov, İ., Əliyev, T. (2018). Qeyri-neft sənayesinin iqtisadiyyatı. Dərslik. Bakı: Bakı Biznes Universiteti, 267 s.
2. Rüstəmov, C. Azərbaycanda sənayenin inkişafı müasir dövrün çağırışı və zamanın tələbidir. https://azertag.az/xeber/Azerbaycanda_senayenin_inkisafi_ muasir_dovrun_chagirisi_ve_ zamanin_telebidir-51040
3. Yüngül sənaye. https://www.azerbaijans.com/content_720_az.html
4. Cəfərov, V. Yüngül sənaye: ixrac ümidimiz. http://www.anl.az/down/meqale/ express/2016/noyabr/516826.htm
5. Azərbaycan Respublikasının ərzaq təhlükəsizliyi Proqramı, 2 mart 2001. https://e-qanun.az/framework/4467
6. Azərbaycan Respublikasında kənd təsərrüfatı məhsullarının istehsalına və emalına dair Strateji Yol Xəritəsi. Azərbaycan Respublikası Prezidentinin 2016-cı il 6 dekabr tarixli Fərmanı ilə təsdiq edilmişdir. https://azertag.az/store/files/Strateji_yol_xeritesi/strateji_yol_xeritesi_kend_teserrufati_mehsullarinin_istehsalina_ve_emalina_dair.pdf
7. Zeynalov, S. (2019). Azərbaycan yüngül sənayesində investisiya proseslərinin dövlət tənzimlənməsinin əsas istiqamətləri. Elm və İnnovativ Texnologiyalar Jurnalı, №8, s.95-106.
8. 2008-2015-ci illərdə Azərbaycan Respublikasında əhalinin ərzaq məhsulları ilə etibarlı təminatına dair Dövlət Proqramı. Azərbaycan Respublikası Prezidentinin 2008-ci il 25 avqust tarixli Sərəncamı ilə təsdiq edilmişdir. https://e-qanun.az/framework/15320
9. Prezident İlham Əliyevin sədrliyi ilə 2020-ci ilin yekunlarına həsr olunmuş videoformatda müşavirə keçirilib. https://www.sosial.gov.az/post_42230106-01-2021

Göndərilib: 30.11.2023 Qəbul edilib: 11.01.2024

DOI: https://doi.org/10.36719/2706-6185/31/10-13

**Pərvin Qafarova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
parvin.gafarova@gmail.com

# ŞAGİRD NAİLİYYƏTLƏRİNİN QİYMƏTLƏNDİRİLMƏSİ KONSEPSİYASI

**Xülasə**

Ümumi təhsilin məzmununun yeniləşdirilməsi, şagird nailiyyətlərinin qiymətləndirilməsi sahəsində də yeni mexanizmlərin tətbiqini zəruri etmişdir. Azərbaycanda "qiymətləndirmə" dedikdə, bəziləri bunu təhsilalanın təlim nəticələrinə aid olan məsələ kimi qəbul edirlər. Lakin dünya təcrübəsində təhsilalanın biliyinə verilən qiymət, həm də müəllimlərin və məktəbin fəaliyyətinə, valideynin təhsilə münasibətinə, məktəb rəhbərlərinin peşəkarlıq səviyyəsinə verilən qiymət kimi qəbul edilir. Belə düşüncə sovet dövründən qalmış qiymətləndirmə qaydalarından və Azərbaycanda qiymətləndirmə üzrə yeni konsepsiyanın olmamasından irəli gəlir. Ənənəvi qiymətləndirmə məzmunun tərkib hissəsi sayılmadığından, həmişə müəllimin subyektiv mülahizələrinə əsaslanırdı, şagirdlərdə təlimə marağı artırmaq əvəzinə, əksinə azaldır, onların inkişafını sistemli şəkildə izləməyə imkan vermirdi və bu da, bir qayda olaraq, şagirdləri qiymət almaq xatirinə oxumağa sövq edirdi. Azərbaycanda 5 ballıq qiymətləndirmə şkalasından 9 ballıq şkalaya keçidlə əlaqədar bəzi regionlarda eksperimentlər aparılmışdır. Nəticə göstərmişdir ki, bal sistemindən asılı olmayaraq, tətbiq edilən qiymətləndirmə sistemi şagirdlərin inkişafını sistemli şəkildə izləməyə imkan vermir, şagirdin nailiyyəti keyfiyyət baxımından deyil, kəmiyyət baxımından qiymətləndirilir. Eyni zamanda qiymətləndirmənin yalnız məktəbdaxili formasının həyata keçirilməsi, milli və beynəlxalq qiymətləndirmənin tətbiq edilməməsi, məktəblərarası müqayisəyə, milli səviyyədə təhlillərə imkan vermirdi və respublikada təhsilin keyfiyyəti barədə etibarlı informasiyanın əldə olunması mümkün olmurdu.

***Açar sözlər:*** *şagird, qiymətləndirmə, bacarıq, nailiyyət*

**Parvin Gafarova**
Azerbaijan State Pedagogical University
doctor of philosophy in pedagogy
parvin.gafarova@gmail.com

## Assessment concept of student achievement

**Abstract**

Renewal of the content of general education necessitated the introduction of new mechanisms in the field of student achievement evaluation. When we say "evaluation" in Azerbaijan, some people consider it as a matter related to the educational results of the student. However, in world experience, the assessment of the students knowledge is also considered as an assessment of the activity of teachers and the school, the parents attitude towards education, and the level of professionalism of school leaders. Such thinking dates back to the Soviet era due to the remaining evaluation rules and the lack of a new concept of evaluation in Azerbaijan. Since traditional evaluation was not considered a part of the content, it was always based on the subjective judgments of the teacher, instead of increasing the interest in learning among students, it reduced it, it did not allow to systematically monitor their development, and this, as a rule, encouraged students to study for the sake of getting a grade. In Azerbaijan, experiments were conducted in some regions in connection with the transition from a 5-point grading scale to a 9- point grading scale. The result showed that regardless of the grading system, the applied grading system does not allow to systematically monitor the development of students, the students achievement is not in terms of quality, evaluated in terms of quantity. At the same time, only intra-school form of evaluation, non-

application of national and international evaluation, did not allow inter-school comparison, analysis at the national level, and it was not possible to obtain reliable information about the quality of education in the republic. Evaluation of student achievements has entered the educational lexicon as a pedagogical concept in recent years. The concept of evaluation of knowledge, skills and habits of students has been used in the pedagogical world for a long time.

***Keywords:*** *student, evaluation, skill, achievement*

## Giriş

Ümumi təhsilin məzmununun yeniləşdirilməsi, şagird nailiyyətlərinin qiymətləndirilməsi sahəsində də yeni mexanizmlərin tətbiqini zəruri etmişdir. Azərbaycanda qiymətləndirmə" dedikdə, bəziləri bunu təhsilalanın təlim nəticələrinə aid olan məsələ kimi qəbul edirlər. Lakin dünya təcrübəsində təhsilalanın biliyinə verilən qiymət həm də müəllimlərin və məktəbin fəaliyyətinə, valideynin təhsilə münasibətinə, məktəb rəhbərlərinin peşəkarlıq səviyyəsinə verilən qiymət kimi qəbul edilir. Belə düşüncə sovet dövründən qalmış qiymətləndirmə qaydalarından və Azərbaycanda qiymətləndirmə üzrə yeni konsepsiyanın olmamasından irəli gəlir. Ənənəvi qiymətləndirmə məzmunun tərkib hissəsi sayılmadığından, həmişə müəllimin subyektiv mülahizələrinə əsaslanırdı, şagirdlərdə təlimə marağı artırmaq əvəzinə, əksinə azaldır, onların inkişafını sistemli şəkildə izləməyə imkan vermirdi və bu da, bir qayda olaraq, şagirdləri qiymət almaq xatirinə oxumağa sövq edirdi. Azərbaycanda 5 ballıq qiymətləndirmə şkalasından 9 ballıq şkalaya keçidlə əlaqədar bəzi regionlarda eksperimentlər aparılmışdı (1).

Nəticə göstərmişdir ki, bal sistemindən asılı olmayaraq, tətbiq edilən qiymətləndirmə sistemi şagirdlərin inkişafını sistemli şəkildə izləməyə imkan vermir, şagirdin nailiyyəti keyfiyyət baxımından deyil, kəmiyyət baxımından qiymətləndirilir (Grebenyukova, 2014: 155). Nəticədə şagirddə özünün səviyyəsi barədə dolğun fikir formalaşmır. Eyni zamanda qiymətləndirmənin yalnız məktəbdaxili formasının həyata keçirilməsi, milli və beynəlxalq qiymətləndirmənin tətbiq edilməməsi, məktəblərarası müqayisəyə, milli səviyyədə təhlillərə imkan vermirdi və respublikada təhsilin keyfiyyəti barədə etibarlı informasiyanın əldə olunması mümkün olmurdu. Şagird nailiyyətlərinin qiymətləndirilməsi" pedaqoji anlayış kimi təhsil leksikonuna yaxın illərdə daxil olmuşdur. Uzun müddət pedaqoji aləmdə şagirdlərin bilik, bacarıq və vərdişlərinin qiymətləndirilməsi" anlayışı işlədilmişdir. Bununla belə, qiymətləndirmə dedikdə, bir qayda olaraq, şagirdlərin gündəlik (cari) qiymətləndirilməsi başa düşülmüşdür. Belə qiymətləndirmə növü isə mahiyyət etibarı ilə heç bir əhəmiyyət kəsb etmir. Şagird, məsələn, biologiya fənnindən dərs ilinin yarısında iki dəfə qiymət almış və onun yarımillik qiyməti həmin iki qiymətin əsasında çıxarılmışdır (İbrahimova, 2008: 18).

Halbuki yarım il ərzində kimyadan xeyli mövzu keçilir. Belə çıxır ki, bütövlükdə yarımillik mövzuların şagird tərəfindən öyrənilib mənimsənilməsi vəziyyəti müəyyən olunmamış qalır. Şagird nailiyyətlərinin qiymətləndirilməsi çox geniş və əhatəli prosesdir. Bu proses, sadəcə, şagirdin nail olduğu təlim nəticələrinin səviyyəsini müəyyənləşdirməyə deyil, bütövlükdə təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət edir. Başqa sözlə, qiymətləndirmə keyfiyyəti idarə edən mühüm bir amil kimi meydana çıxır. Davamlı və dinamik xarakter daşıyan şagird nailiyyətlərinin qiymətləndirilməsi prosesində şagirdlərin fəaliyyətlərinin daim nəzarətdə saxlanması, onların irəliləyişlərinin, yaxud geriləmələrinin izlənilməsi və bu məqsədlə monitorinqlərin aparılması ciddi tələb kimi qarşıya qoyulur. Məhz həmin monitorinqlərin nəticələri təlim prosesinin optimal qurulması, müəllimlərin işinin təkmilləşdirilməsi, habelə kurikulumlarda və dərsliklərdə zəruri dəyişikliklərin olması haqqında müvafiq qərarlar qəbul etməyə imkan verir. Yeni fənn kurikulumlarında məzmun standartları ilə yanaşı, qiymətləndirmə standartları da öz əksini tapmışdır (Hüseynov, Hacıyeva, 2015: 148).

Həmin standartlar məzmun standartlarında ifadə edilmiş təlim nəticələrinə şagirdlərin hansı səviyyədə nail olmalarını qiymətləndirməyə xidmət edir. Bununla əlaqədar dünya təcrübəsinə uyğun surətdə qiymətləndirmənin 4 səviyyədə aparılması təklif edilmişdir. 1 və 2-ci səviyyələr

əksər şagirdlər, 3 və 4-cü səviyyələr isə müvafiq olaraq istedadlı və daha istedadlı şagirdlər üçün nəzərdə tutulu (Hüseynova, 2018: 23-28).

Bununla belə, etiraf etmək lazımdır ki, məzmun standartlarının reallaşdırılma səviyyəsini əks etdirən bu cür qiymətləndirmə standartlarının hazırlanması və tətbiqi sahəsində kifayət qədər səriştəyə malik olmaq üçün daha ciddi çalışmaq, toplanmış təcrübəni daha da artırmaq tələb olunur. Ona görə də ayrı-ayrı fənlər üzrə bu gün üçün müəyyən edilmiş qiymətləndirmə standartlarının növbəti illərdə qismən dəyişdirilməsi, onların üzərində dəqiqləşdirmələr aparılması təbii qəbul olunmalıdır. Eyni zamanda standartlarda təsbit olunmuş biliklər daşıdıqları mahiyyətə görə 3 kateqoriyaya (deklorativ, prosedural, kontekstual) bölündüyündən onların reallaşdırılması üzrə tələb edilən bacarıqlar da fərqli müəyyən edilir. Məsələn, deklorativ biliklər bilavasitə yaddaşa əsaslanır, zəruri informasiyaların, təriflərin, terminlərin mənimsənilməsini nəzərdə tutur. Ona görə də bu proses "bilmə" və "anlama" fəaliyyətləri ilə əlaqədar olur (İnteqrativ kurikulum, 2006: 261). Prosedural biliklər tətbiq, kontekstual biliklər isə tədqiqatçılıq, yaradıcılıq fəaliyyəti ilə bağlıdır. Göründüyü kimi, biliklərə görə fəaliyyətin, necə deyərlər, xüsusi çəkisi müxtəlif olduğundan onların hamısını 4 səviyyə ilə qiymətləndirməyə, bəlkə də ehtiyac yoxdur. Bu mənada axtarışların və tədqiqatların genişləndirilməsi çox vacibdir. Həm də fənlər üzrə məktəbdaxili qiymətləndirmə ilə standartların mənimsənilməsi səviyyəsinin qiymətləndirilməsi arasında məntiqi əlaqəni ehtiva edən sxem-cədvəlin müəyyən olunmasına, yəqin ki, ehtiyac vardır (Kashlev, 2013: 224). Belə olan halda şagirdlərin təlim nəticələrinin məzmun standartlarının tələblərinə cavab verməsi vəziyyəti daha aydın görünər.

Qeyd edilən məqsədlərin mütəşəkkil həllinə başlamaq üçün Təhsil Nazirliyi tərəfindən Azərbaycan Respublikasının ümumi təhsil sistemində Qiymətləndirmə Konsepsiyası" hazırlanmış və Nazirlər Kabinetinin 13 yanvar 2009-cu il tarixli, 9 nömrəli qərarı ilə təsdiq edilmişdir (İsmixanov, 2011: 289). Konsepsiyada müasir dövrdə qiymətləndirmə fəaliyyətinə qoyulan tələblər, şagird nailiyyətlərinin qiymətləndirilməsi sisteminin vəzifələri, əsas xüsusiyyətləri, əsas qiymətləndirmə növləri, qiymətləndirmə standartlarının və qiymətləndirmə vasitələrinin hazırlanması, məktəbdaxili qiymətləndirmənin mahiyyəti və məzmunu, şagird nailiyyətlərinin və irəliləyişlərinin monitorinqi sistemi, kurikulum üzrə qiymətləndirmə (şagird fəaliyyətinin təlim standartlarına uyğunluğunun müəyyənləşdirilməsi), buraxılış imtahanları (ümumtəhsil pillələri üzrə yekun qiymətləndirmə), milli qiymətləndirmənin məqsədləri, milli qiymətləndirmə üzrə təlimatların məqsədi və strukturu, beynəlxalq qiymətləndirmə proqramı üzrə həyata keçiriləcək əsas tədbirlər öz əksini tapmışdır.

Konsepsiyanın və bu sənəd əsasında hazırlanacaq mərhələli İnkişaf Proqramının həyata keçirilməsi nəticəsində aşağıdakı nailiyyətlərin əldə edilməsi gözlənilir: təhsildə qiymətləndirmə, imtahanların keçirilməsi sistemində islahat aparılması üçün uzunmüddətli strategiya işlənib hazırlanacaq, bu sahədə yeni mexanizmlər yaradılacaq, fəaliyyət vahid mövqedən koordinasiya olunacaq; təhsil sistemində məktəbdaxili və milli qiymətləndirmələrin keçirilməsi metodologiyası, qiymətləndirmə standartları və vasitələrinin yaradılması və tətbiqi üçün müvafiq təlimatlar hazırlanacaq, bu fəaliyyət kurikulum islahatı ilə əlaqələndiriləcək.

## Ədəbiyyat

1. Interaktivnyye metody, formy i sredstva obucheniya (metodicheskiye rekomendatsii) [Elektronnyy resurs]. Rezhim dostupa: http://interaktiv.pdf (data obrashcheniya: 19.09.2021).
2. Grebenyukova, V.I. (2014). Aktivnyye i interaktivnyye metody obucheniya: Uchebnoye posobiye. Nizhnevartovsk: Izd-vo Nizhnevart. gos. un-ta, 155 s.
3. İbrahimova, X.Q. (2008). Biologiyanın tədrisində fəal təlim metodlarının tətbiqi. Pedaqoji elmlər namizədi alimlik dərəcəsi almaq üçün təqdim edilmiş dissertasiyanın avtoreferatı. Bakı, 18 s.
4. Hüseynov, Ə., Hacıyeva, H. (2015). Ümumtəhsil məktəblərində biologiyanın tədrisində kurikulumun tətbiqi. Bakı, 148 s.
5. Hüseynova, E. (2018). Şəxsiyyətin fəal mövqeyinin inkişaf etdirilməsinin tarixi-pedaqoji səciyyəsi. Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri. № 1, s.23-28.

6. İnteqrativ kurikulum. (2006). Arnhem. Niderland, 261 s.
7. Kashlev, S.S. (2013). Interaktivnyye metody obucheniya: ucheb. metod. Posobiye. Minsk: tetra Sistems, 224 s.
8. İsmixanov, M. (2011). Pedaqogikanın əsasları. Bakı: BDU, 289 s.

Göndərilib: 01.12.2023 Qəbul edilib: 20.01.2024

DOI: https://doi.org/10.36719/2706-6185/31/14-17

**Sevda İsmayılova**
Bakı Dövlət Universiteti
tarix üzrə fəlsəfə doktoru
sevdaismayilova@rambler.ru

# 1937-1938-Cİ İLLƏRİN KÜTLƏVİ REPRESSİYALARI VƏ AZƏRBAYCAN ALİ TƏHSİL SİSTEMİ

**Xülasə**

Məqalədə 1937-1938-ci illərin kütləvi repressiyalarının Sovet hakimiyyətinin Azərbaycanda milli-mənəvi sahədə həyata keçirdiyi siyasətin tərkib hissəsi olduğu, bu repressiyaların Azərbaycan cəmiyyətinin zəkalarını, yaradıcı şəxslərini, özündə azərbaycançılıq fikirlərini daşıyan təbəqəsini məhv etməyi yönəldiyi araşdırılır. Onların əksinqilabçı-trotskiçi fəaliyyəti, silahlı üsyan hazırlamaqla hakimiyyət çevrilişi etmək və s.kimi uydurma ittihamlarla məhkum edilmələri göstərilir, "böyük terror"un mahiyyəti açıqlanır.

***Açar sözlər:*** *Azərbaycan, ali təhsil sistemi, 1937-1938, repressiya, böyük terror, üçlüklər*

**Sevda Ismayilova**
Baku State University
PhD in history
sevdaismayilova@rambler.ru

## Mass repressions of the 1937-1938 years and higher education system of Azerbaijan

**Abstract**

The article deals with the mass repressions of the1937-1938 years, that were a part of the policy implemented by the Soviet authorities in the national and moral sphere in Azerbaijan, and that these repressions were targeted at destroying the intelligentsia, creative people, and the stratum that carried the idea of Azerbaijaniism. Their counter-revolutionary-Trotskyist activities, to make a revolution by preparing an armed uprising, etc., and the nature of the "great terror" was illuminated.

***Keywords:*** *Azerbaijan, higher education system, 1937-1938 years, repression, great terror, triads*

## Giriş

Keçmiş SSRİ-də 1937-1938-ci illərin kütləvi repressiyalarına məruz qalan respublikalardan biri də Azərbaycan olmuşdu. Rusiya Federasiyası Federal Təhlükəsizlik Xidməti arxiv göstəricilərinə görə siyasi əsaslar üzrə SSRİ-də 1937-ci ildə 936.750 nəfər, 1938-ci ildə isə 638.509 nəfər, ümumilikdə 1.575.259 nəfər həbs edilmiş, onların böyük bir qismi isə güllələnmişdi (Lubyanka, 2004: 659-650). 1937-ci ildə Moskvanın komandası ilə Azərbaycanda da qolçomaq, əksinqilabçı, milliyyətçi adı ilə kütləvi həbslər başlandı. Repressiyaya məruz qalanlar içərisində Azərbaycan ziyalıları, elm, təhsil, ədəbiyyat, mədəniyyət, incəsənət xadimləri xüsusi yer tuturdu. Sovet hakimiyyətinin milli-mənəvi sahədə həyata keçirdiyi siyasətin tərkib hissəsi olan repressiyalar Azərbaycan cəmiyyətinin zəkalarını, düşünən beyinlərini, yaradıcı şəxslərini, özündə azərbaycançılıq fikirlərini daşıyan təbəqəsini məhv etməyi yönəlmişdi. Həbs edilənlərin sayı o qədər çox idi ki, adi məhkəmə yolu ilə onların mühakiməsini çatdırmaq olmurdu. İqtisadi və siyasi böhrandan çıxış yoiunun məhz "Böyük terror"un həyata keçirilməsində görən Stalin rəhbərliyi ölkə əhalisini kütləvi repressiyalara məruz qoydu. Bununla bağlı 1937-ci ilin iyulundan yerlərdə "üçlüklər" yaradıldı. XDİK, prokurorluq və partiya təşkilatlarından ibarət bir tərkib. Belə üçlük 1937-ci il 10 iyulda Azərbaycanda da Y.Sumbatov, T.Quliyev, D.Axundzadədən ibarət bir tərkibdə yaradılmışdı (Lubyanka, 2004: 241). Xalq Daxili İşlər Komissarı Yejov 1937-ci il iyulun 30-da

keçmiş qolçomaqların, cinayətkarların və digər antisovet elementlərin repressiya edilməsi haqqında 00447 saylı əmr imzaladı. Əmrdə göstərilirdi ki, 1937-ci il avqustun 5-dən bütün müttəfiq və muxtar respublikalarda, diyar və vilayətlərdə keçmiş qolçomaqların, fəal antisovet elementlərin və cinayətkarların repressiya edilməsi əməliyyatına başlansın (Zeynalov, 2017: 275). Cənubi Qafqazda daha çox repressiya edilənlər Azərbaycanda idi. 1938-ci il yanvarın 31-də ÜIK(b)P MK respublika, vilayət, diyarlar üzrə repressiyaya məhkum ediləcəklərin əlavə sayını müəyyənləşdirdi. Yaxın üç ay ərzində Azərbaycanda 2000 nəfərin güllələnməsi, 1000 nəfərin isə uzunmüdətli həbsi nəzərdə tutulmuşdu.

**1930-cu illərin repressiya qurbanları nədə ittiham olunurdular.** 1934-cü ildən Az.K(b)P MK-nın birinci katibi olmuş M.C.Bağırov da Stalinin etimadını doğrultmağa çalışır, onun rəhbər göstərişlərinə əməl edir, sovet işğal rejimini təmin edəcək manqurt kadrlar hazırlanması siyasəti həyata keçirirdi. Sovet rejimi Azərbaycan xalqının milli ruhunu məhv etməyə, dövlətçilik ənənələrini yox etməyə çalışırdı. Milli respublikalarda kommunst rejiminin mövqeyini möhkəmləndirməkdən ötrü milli dilin işlədilməsi üçün şəraitin yaradılması tələb olunurdu. Həm də xalq kütlələrinə kommunst ideyalarını aşılamaqdan ötrü savadlılığı, təhsil sisteminin səviyyəsini qaldırmaq lazım idi. 1924-cü ildə Azərbaycan dili haqqında qərar qəbul edildi, ali məktəblərin milliləşdirilməsi prosesi başlandı. 1923-cü il iyulun 15-də AK(b) P MK-nın qərarı ilə ali məktəblərə qəbul zamanı azərbaycanlılara üstünlük verilməli idi. 1923/24-cü dərs ilində qəbul artırıldı. ADU tələbələrinin ümumi sayı 1955 nəfər oldu ki, bunun da 404-ü azərbaycanlı idi (Atakişiyev, 1991: 141). 1926-1929-cu illərdə Bakı Dövlət Universitetinin ilk azərbaycanlı rektoru olmuş Tağı Şahbazi Universitetin türkləşdirilməsi sahəsində fəaliyyətə başladı. T.Şahbazi tələbələrin müxtəlif elmlərə daha dərindən yiyələnməsi üçün türk (Azərbaycan) dilinin tədrisi ilə yanaşı, onların rus dilini də səlis öyrənmələrinə çalışırdı (ARDA, 2). T.Şahbazinin təşəbbüsü ilə gənc elmi qüvvələr axtarılır, universitetə dəvət olunurdular. O, S.Kazımbəyov, Ə.Qubaydulin, B.Çobanzadə, B.Həsənbəyov. B.Talıblı, V.Xuluflu və b. yanaşı, universitetə görkəmli rus alimlərini də dəvət edirdi (ARDA, 13 arx., 34). Lakin1930-cu illərin qanlı repressiyası Tağı Şahbazidən də yan keçmədi. Azərbaycanda məktəblərin milliləşdirilməsi, milli kadrların hazırlanması, türkdilli mütəxəssislərin hazırlanmasına üstünlük verən BDU-nun rektoru Tağı Şahbazi millətçilikdə ittiham edildi. O,11 iyul 1937-ci ildə həbs edildi. O, hələ 1937-ci ilin martın 4-də "millətçi-təmayülçülüyə mənsub olduğunu gizlətdiyinə, əksinqilabçı-millətçi hərəkətləri və riyakarlığına görə" partiyadan xaric edilmişdi (Bünyadov, 1990: 15). T.Şahbazinin ətrafında qara buludlar əslində 30-cu illərin əvvəlindən toplaşırdı. 1933-cü ildə tənqidçilər onu yaradıcılığında ziddiyyət, sapıntı, əyrilikdə, sosialist sayıqlığını itirməkdə ittiham edirdilər. AK (b)P MK Bürosunun 31 mart 1937-ci il tarixli 187 saylı protokolunun "Əksinqilabçı trotskiçi-müsavat və milliyyətçi ədəbiyyat və dərsliklərin müsadirəsi haqqında" qərarında göstərilirdi: "1.İfşa edilmiş əksinqilabçı trotskiçi-müsavat agentlərinin ASSR-də nəşr edilmiş kitablarının kitabxana və kitab ticarəti şəbəkələrindən müsadirə edilməsi baş ədəbiyyat idarəsinə tapşırılsın; 2. Zeynallı Əli Nazim, Çobanzadə, Veysəl Mustafayev və b. kimi əksinqilabçı-millətçilər tərəfindən tərtib edilmiş ana dili və ədəbiyyatı dərslik və müntəxabatlarında ziyankar siyasi səhvlər aşkarlandığına görə məhz; a) bu dərsliklərə gənclər arasında geniş şöhrət tapmış, müsavatçı-millətçi yazıçılardan Yusif Vəzir, Hüseyn Sadıq, Qantəmir, Şahbazi T., Talıblı B.A., Rəfili M., Müşfiq və b. əsərləri daxil edildiyinə; b) dərsliklərdə ən yaxşı ədiblərin yaradıcılığı "yalançı sosializm" kimi qiymətləndirildiyinə; v) Azərbaycan, rus, xarici ədəbiyyat klassikləri çox zəif göstərildirinə görə və s." (ARPİİİSSA: 19). Azərbaycan SSR XDİ Komissarı Yemelyanovun 20 fevral 1939-cu il tarixli "Azərbaycan SSR-də əksinqilabi formalaşma və antisovet elementlərin ləğv və darmadağın edilməsi"nə aid tərtib etdiyi qısa icmala Azərbaycan ali məktəblərində geniş fəaliyyət göstərən əksinqilabçı – millətçi təşkilatın ziyankar qrupuna APİ-də professor Rizabəyli, elmi işçi və müəllim Əli Nazim, Xocayev S., ADU-da pr. B.Həsənbəyov, M.Əliyev, elmi işçi və müəllim İ.Həsənov, A.Məmmədov, Tağı Şahbazinin də adı daxil edilmişdi (ARPİİİSSA, 27). Həmin icmalın "Mətbuat və ədəbiyyat sahəsində əksinqilabi ziyankar iş" bölməsində göstərilir ki, ləğv edilmiş əksinqilabçı-milliyyətçi təşkilat öz üzvlərini nəşriyyat, mətbuat və ədəbiyyat sahəsində yerləşdirib. Y.Vəzirov, Talıblı və b. əsərləri ilə yanaşı Tağı Şahbazinin də yaradıcılığında

əksinqilabçı-millətçi – pantürkist, böhtançı istiqamət "aşkarlanıb". 1937-ci il noyabrın 2-də T.Şahbazi müstəntiqin diktəsi ilə Azərbaycan SSR-də burjua-millətçi quruluş yaratmaq məqsədilə çevriliş hazırlayan əksinqilabi təşkilata həmid Sultanov, Baqi Cəfər, Ruhulla Axundov tərəfindən cəlb edildiyini "etiraf" etmişdi.

API və ADU-nun dil və ədəbiyyat kafedrasının müdiri, professor, türk dili və ədəbiyyatı ilə bağlı 150-dən çox kitab, məqalə müəllifi olan Bəkir Çobanzadə 1937-ci il yanvarın 26-da 1924-cü ildən Bakıda yaşadığı dövrdə əksinqilabi-millətçi fəaliyyətdə ittiham edilərək həbs edilmişdi. (Bünyadov, 1993: 89). Dindirilmə əsasən erməni müstəntiqlər tərəfindən iki mərhələdə aparılırdı. İlk dindirilmələdə müttəhimlər uydurulmuş ittihamları inkar edir, lakin son dindirilmələrdə amansız işgəncələr nəticəsində "günahlarını" "etiraf" edirdilər. Onların uydurma təqsirlərini sübut etmək üçün artıq güllələnmiş müttəhimlərin saxtalaşdırılmış ifadələri dəlil kimi əsaslandırılırdı.

Azərbaycan Dövlət Universitetinin Tarix fakültəsinin dekanı, Moskvada Qırmızı Professorlar İnstitutunu bitirmiş Boris Tixomirov da dəhşətli içgəncələrdən sonra istintaqa lazım olan ifadələr verməyə məcbur edilmişdi (Əziz, 2009: 5). Azərbaycan Dövlət Universitetinin rektoru, eyni zamanda Siyasi iqtisad kafedrasının müdiri, Moskvada Qırmızı Professorlar İnstitutunun məzunu Balabəy Həsənbəyov 1937-ci il yanvarın 7-də əksinqilabçı-trotskiçi fəaliyyətdə ittiham edilərək həbs edilmişdi. Boris Tixomirov da dəhşətli içgəncələrdən sonra Balabəy Həsənbəyov əleyhinə ifadələr verməyə məcbur edilmişdi. Bu ifadələrdə göstərilirdi ki, B.Həsənbəyov əksinqilabçı-trotskiçiləri himayə etmişdir. XDİK-ə məlum olduğuna görə, o, ADU-da millətçi əhvali-ruhiyyəli şəxslərdən A.Məmmədov, H.Verdiyev və b. ibarət dəstə düzəldib, millətçiliyi qızışdırmaq üçün tədrisin yalnız rus dilində aparılması göstərişini verib (Əziz, 2009: 5-7). Balabəy Həsənbəyov silahlı üsyan hazırlamaq, casusluq, partiya və hökumət rəhbərinə qarşı terror tətbiq etməkdə ittiham edildi. Hüseynəli Biləndərli, Aleksandr Bukşpan, A.Məmmədov, Abdulla Tağızadə, Abdulla Şərifov, Əziz Qubaydullin və yüzlərcə elm, təhsil, mədəniyyət nümayəndələri əksinqilabçı-trotskiçi fəaliyyət, partiya və hökumət rəhbərinə qarşı terror aktları hazırlanması, hakimiyyət çevrilişi və s. kimi uydurma ittihamlarla azadlıqdan məhrum edilmiş, güllələnmə cəzasına məhkum edilmişdilər.

ADU-da ən çox cəzaya məruz qalan SSRİ xalqları tarixi, Siyasi iqtisad və Fəlsəfə kafedralarının əməkdaşları oldular. 1937-ci ildə ADU-nun rektoru, professor B.Həsənbəyov həbs edildikdən sonra onun başçılıq etdiyi siyasi iqtisad kafedrasının müəllimləri professor Anatoliy Çiçikalov, professor Safronoviç, dosent Əli Məmmədbəyov, dosent İsrafil Axundov, ADU-nun partiya təşkilatının katibi Əbdül Yusifov, hazırlıq şöbəsinin müdiri Baba Babayev və b. cəza aparatının qurbanı oldular. 30-cu illərdə ADU-nun müəllimlərindən Əhməd Kazımov, Heydər Verdiyev, Ədil Abdullayev, Abbas Yusifov, Cavad bəy Rəfibəyov, Mirzə Məmmədov, Əsgər Quliyev, Əbülfəz Quliyev, Əşrəf Quliyev, Əbülfəz Axundov, Məcid Həmzəyev, Nikolayev, Belyayev, Drabkin və b., həmçinin Bakıda yaşayan və Sovet İttifaqının müxtəlif yerlərindən işləməyə dəvət olunan istedadlı, yüksək ixtisaslı tarixçi kadrlar - rus, yəhudi, tatar, ərəb, alman, eston və eləcə də digər millətlərin nümayəndələri də repressiyaya məruz qaldılar (Əmrahov, 2022: 22).

**Sürətli məhkəmələrin amansız hökmləri.** Tağı Şahbazi 1938-ci il yanvarın 2-də Hərbi Kollegiyanın 15.30-dan 15.45-dək davam edən məhkəmə iclasında ən ağır cəzaya-güllələnməyə məhkum edildi (Bünyadov, 1993:193). Bəkir Çobanzadə 1937-ci il oktyabrın 12-də Hərbi Kollegiyanın 20 dəqiqə davam edən məhkəmə iclasında ən ağır cəzaya-güllələnməyə məhkum edildi (Bünyadov, 1993: 199). Boris Tixomirov 1937-ci il sentyabrın 5-də SSRİ Ali Məhkəməsinin Hərbi Kollegiyasının 15 dəqiqə davam edən qapalı məhkəmə iclasında ən ağır cəzaya-güllələnməyə məhkum edildi (Əziz, 2009: 5). Balabəy Həsənbəyov 1937-ci il oktyabrın 11-də SSRİ Ali Məhkəməsinin Hərbi Kollegiyasının 15 dəqiqə davam edən məhkəmə iclasında ən ağır cəzaya-güllələnməyə məhkum edildi (Əziz, 2009: 7). Hüseynəli Biləndərli, Aleksandr Bukşpan, Abdulla Tağızadə, Abdulla Şərifov, Əziz Qubaydullin də oxşar uydurma ittihamlarla güllələnmə cəzasına məhkum edildilər.

## Nəticə

1955-ci il yanvar ayının 13-də Azərbaycan KP MK-nın bürosunda «Həbsdən azad olan, sürgündən qayıdan və bəraət alan vətəndaşların ərizələrinə baxılması üzrə komissiya» yaradılması haqqında qərar qəbul edildi. Azərbaycan KP MK-nın yaratdığı komisiyada əksinqilabi cinayətdə günahlandırılmış 1209 adamı əhatə edən 1031 işə baxıldı, 1107 adama bəraət verildi (Ismailov, 2006: 216-254). Stalin şəxsiyyətinə pərəstişi, totalitar sistemi formalaşdıran 30-cu illərin qurbanlarından olan Tağı Şahbazi, Bəkir Çobanzadə, Balabəy Həsənbəyov, Hüseynəli Biləndərli, Boris Tixomirov, Aleksandr Bukşpan, Abdulla Tağızadə, Abdulla Şərifov, 1956-cı ildə, Əziz Qubaydullin 1957-cı ildə bəraət aldılar. İ.Stalinin ölümündən sonra Sov.İKP MK-nın iyul plenumunda L.Beriyanın cinayətkar fəaliyyəti ilə bağlı M.C.Bağırovun da adı hallandırılmağa başlandı. O, nəinki respublikaya rəhbərlikdən, eləcə də Azərbaycandan uzaqlaşdırıldı, 29 mart 1954-cü ildə həbs edildi. 2 mart 1956-cı ildə güllələnmə cəzasına məhkum edildi. Törətdikləri cinayələrə görə T.M.Borşov, X.İ.Qriqoryan, R.A.Markaryan güllələndilər, A.S.Atakişiyev və S.F.Yemelyanov isə 25 il azadlıqdan məhrum edildilər (Rüstəmli, Alıyev, 1993: 117). Stalin ən yaxın adamlarına da etibar etmirdi. Yüz minlərlə insanın ölümünə səbəb olan siyasi orqan işçiləri həbs edilir və güllələnirdilər. 1937-ci ilin fevralında Orconikidze intihar etdi, Yaqoda və Yejov güllələndi. 00447 saylı əmr əsasında kütləvi repressiyalar və "Böyük terror" aksiyasının həyata keçirilməsi Kommunist Partiyasının, Siyasi Büronun və XDİK rəhbərliyinin nəzarəti altında olmuşdu. Amansız terror nəticəsində partiya rəhbərliyi və dövlət hakimiyyətində Stalin tək hakimiyyəti, monarxiyası yaradıldı (Məmmədov, 2022: 376-377).

## Ədəbiyyat

1. Lubyanka. (2004). Stalin i glavnoye upravleniye gosbezopasnosti NKVD.1937-1938. Pod red.akademika A.N.Yakovleva. Moskva: izd-vo «Materik», 736 s.
2. Lubyanka. (2004). Stalin i glavnoye upravleniye gosbezopasnosti NKVD.1937-1938. Pod red.akademika A.N.Yakovleva. Moskva: izd-vo «Materik», 736 s.
3. Zeynalov. (2017). Totalitar Sovet Cəmiyyəti: Tarixin ibrət dərsləri-Azərbaycan SSR XX əsrin 20-50-ci illərində. Bakı: "Ləman nəşriyyat poliqrafiya" MMC, 720 s.
4. Atakişiyev, A. (1991). M.Ə.Rəsulzadə adına Bakı Dövlət Universitetinin tarixi. Bakı: Bakı Universiteti nəşriyyatı, 528 s.
5. ARDA, f.1640, siy.5, s.v.303.
6. ARDA, f.1640, siy.1, s.v.37.
7. Buniyatov, Z. (1990). Sledstvennoye delo, № 12493. Baku: Elm.
8. ARPİİİSSA, f.1, siy.20, iş 40.
9. ARPİİİSSA, f.1, siy.22, iş 296.
10. Bünyadov, Z. (1993). Qırmızı terror. Bakı: Azərnəşr, 331s.
11. Boran, Ə. (2009). Repressiyaya məruz qalan alimlər. "Azərbaycan" qəzeti, 2 oktyabr.
12. Boran, Ə. (2009). Repressiyaya məruz qalan alimlər. "Azərbaycan" qəzeti, 2 oktyabr.
13. Əmrahov, M. (2022). "1937-1938-ci il Repressiyalari Sovet Dövlətinin Azərbaycan Xalqına Qarşı Soyqırımı Siyasətinin Davamı". Akademik Tarih ve Düşünce Dergisi, c. 9, s. 3, s.792-819.
14. Bünyadov, Z. (1993). Qırmızı terror. Bakı: Azərnəşr, 331 s.
15. Bünyadov, Z. (1993). Qırmızı terror. Bakı: Azərnəşr, 331 s.
16. Boran, Ə. (2009). Repressiyaya məruz qalan alimlər. "Azərbaycan" qəzeti, 1, 2 oktyabr.
17. Boran, Ə. (2009). Repressiyaya məruz qalan alimlər. "Azərbaycan" qəzeti, 2 oktyabr.
18. Ismailov, E. (2006). Azerbaydzhan. 1953-1956. Pervyye gody ottepeli. Baku: Adil'ogly, 351 s.
19. Rüstəmli, N., Alıyev, T. (1993). Mir Cəfər Bağırovun məhkəməsi. Bakı: Yazıçı, 120 s.
20. Məmmədov, N. (2022). Azərbaycanda dövlət quruculuğu (XX əsrin 20-30-cu illəri). Bakı: Bakı Dövlət Universiteti, 464 s.

Göndərilib: 25.11.2023 Qəbul edilib: 19.01.2024

DOI: https://doi.org/10.36719/2706-6185/31/18-21

**Pərvin Qafarova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
pedaqogika üzrə fəlsəfə doktoru
parvin.gafarova@gmail.com

# BİOLOGİYANIN TƏDRİSİNDƏ İKT-nin TƏTBİQİNİN ƏHƏMİYYƏTİ

**Xülasə**

Tədris prosesində İKT-nin tətbiq edilməsi, tədrisin tərkibinin zənginləşməsinə, ona məntiqi və axtarıcı xarakter verməklə bərabər, şagirdlərin öyrənmək marağının aktivləşdirilməsinə, onların yaradıcılıq qabiliyyətlərinin inkişaf etdirilməsinə və zehni fəaliyyətlərinin stimullaşdırılmasına xidmət edir.

İKT avadanlığının, o cümlədən interaktiv lövhənin, kompyuterin, proyektorun quraşdırılması, əks əlaqəli multimediyalı auditoriyanın təşkili ilə virtual sinif otaqlarının yaradılması problemin həllinə kömək edir. Elektron kitabxanaların yaradılması isə müəllimlərin hər bir dərslərində multimediyadan istifadə imkanlarını artırır. İKT vasitəsi ilə səs, mətn, şəkil, animasiya, video kimi məlumatları əldə etmək mümkündür. Tərcümə proqramları: dilmanc, poliqlot, linqvo, Google translate. Fənn üzrə toplanmış informasiyanın elektron vasitələrlə ana dilinə çevrilməsi və istifadəsinə imkan yaranır. Fənn tədris olunan zaman elektron lövhə, printer, skayner kimi qurğular təlim prosesinin effektli aparılmasını təmin edir.

İKT-dən istifadə edilməsi müəllimə pedaqoji elmlərin, o cümlədən biologiyanın tədrisinin inkişaf tendensiyalarını izləməyə imkan verir. Onun peşəkar səviyyəsini yüksəltməyə, dünyagörüşünü artırmağa, ən əsası isə bioloji biliklər bazasının genişləndirməsinə, sistemləşdirməsinə, dərsliklərlə sərbəst işləməsinə, əlavə informasiyalar toplanmasına kömək edir.

***Açar sözlər:*** *İKT, biologiya, müəllim, şagird, pedaqoji elm*

**Parvin Gafarova**
Azerbaijan State Pedagogical University
doctor of philosophy in pedagogy
parvin.gafarova@gmail.com

## The importance of the application of ICT in the teaching of biology

**Abstract**

The application of ICT in the teaching process serves to enrich the content of teaching, to give it a logical and searching character, to activate students’ interest in learning, to develop their creative abilities and to stimulate their mental activities.

The installation of ICT equipment, including an interactive board, a computer, a projector, and the creation of virtual classrooms with the organization of an interactive multimedia audience help to solve the problem. The creation of electronic libraries increases the possibilities of using multimedia in each of the teachers; lessons. It is possible to obtain information such as sound, text, image, animation, video through ICT. Translation programs are: dilmanc, polyglot, lingvo, Google translate. It becomes possible to convert and use the information collected in the subject by electronic means into the native language. When the subject is taught, devices such as electronic boards, printers, and scanners ensure the effective conduct of the training process.

The use of ICT allows the teacher to follow the development trends of pedagogical sciences, including teaching of biology. It helps to raise his professional level, to increase his outlook, and most importantly, to expand and systematize his biological knowledge base, to work freely with textbooks, and to collect additional information.

***Keywords:*** *ICT, biology, teacher, student, pedagogical science*

## Giriş

Bildiyimiz kimi İKT avadanlıqlarına aid edilən ən əsas aparat kompüter və ona əlavə olunan giriş-çıxış qurğularıdır. Kompüter və onun giriş-çıxış qurğuları İKT-nin təhsildə tətbiqində əsas rol oynayan vasitlərdəndir. Proqram təminatına gəldikdə Ms Word, Ms Excel, Ms Power Point proqramları aid edilir. Təhsildə istifadə olunan İKT avadanlıqları dedikdə həm bu məqsədə xidmət edən elektron aparat, həm də proqram təminatı başa düşülür. Kompüterin giriş-çıxış qurğuları dedikdə klaviatura, monitor, mouse (siçanı), skaner, printer, plotter, qrafiki planşet (digitizer), web-kamera, TV-tüneri, multimedia vasitələri (səs kolonkası, səs kartı, kamera), modern və s. misal göstərmək olar.

Ümumtəhsil məktəblərində müasir və interaktiv təhsil modelinin həyata keçirilməsi məktəbin və müəllim heyətinin qarşısına yeni tələblər qoyur. Bu tələblərin ən əsası tədrisdə İKT- dən səmərəli istifadə edilməsidir. Bunun üçün məktəblərdə bir sıra hazırıq işlərinin həyata keçirilməsi lazım gəlir (Abışov, 2011). İlk növbədə pedaqoji heyətin İKT savadlılığı artırılmalı, təlim-tədris prosesinə innovativ yanaşmanı formalaşdıran İKT-nin təhsil sisteminə daxil edilməsidir. Tədrisə verilən müasir tələblərin gözlənilməsi, yeniliklərin dəyişikliklərin məktəblərdə uğurla və səmərəli tətbiqi müəllimin də tədris prosesinə fərqli yanaşmasını zəruri etmişdir. Bu səbəbdən də müəllimlərin İKT bacarıqlarına yiyələnməsi, tədris prosesində İKT bacarıqlarından pedaqoji alət kimi istifadə etməsi zərurəti yaranır. Bu nöqteyi-nəzərdən İKT-nin təlim prosesində tətbiqi, elektron tədris sistemlərinin effektivliyinin artırılması, nəticə etibarilə təhsilin keyfiyyətinin yüksəldilməsi baxımından xüsusi aktuallıq kəsb edir. Günümüzdə informasiya cəmiyyətinin və dünya ölkələri ilə rəqabətə girə biləcək yüksək texnologiyalı milli iqtisadiyyatın yaradılması ölkəmizin dövlət siyasətinin əsas istiqamətinə çevrilmişdir. Bununla da informasiya əsrinin tələblərinin ödənilməsi, dünya təhsil sisteminə inteqrasiya edilməsi prosesi gedir (İbrahimova, 2005).

İKT-nin əhəmiyyətinə gəldikdə isə ondan istifadə etdikdə özünüyoxlama testlərindən istifadə edilməsi, distant təhsilin həyata keçirilməsi, mövzu üzrə cədvəl və sxemlərin hazırlanması, təqdimatların aparılması, müzakirəsinin təmin edilməsi, şagirdlərin bilik və bacarıqlarının qısa müddətdə qiymətləndirilməsi, müxtəlif layihələr işlənməsi və s. mümkün olur ("Təhsildə Qloballaşma və İKT", 2008).

Ümumiyyətlə, İKT-dən tədrisdə istifadə edilməsinin üstünlükləri çoxdur. Belə ki,

müəllimin verdiyi suala sinifdəki şagirdlərin hamısı kompyuter vasitəsilə eyni zamanda cavab verir, vaxt itkisinə yol verilmir. Bütün uşaqlar dərs prosesində fəal iştirak etmək imkanı qazanırlar. (Bəşirova, 2009).

Tədris prosesində İKT-nin tətbiq edilməsi, tədrisin tərkibinin zənginləşməsinə, ona məntiqi və axtarıcı xarakter verməklə bərabər, şagirdlərin öyrənmək marağının aktivləşdirilməsinə, onların yaradıcılıq qabiliyyətlərinin inkişaf etdirilməsinə və zehni fəaliyyətlərinin stimullaşdırılmasına xidmət edir (Abışov, 2011: 208).

Virtual laboratoriyalarda şagirdlər istənilən kimyəvi reaksiyanın, fiziki, bioloji, coğrafi proseslərin izahını və video görüntülərini izləyə biləcəklər. Müəllim dərsi izah etmək üçün lövhədə tabaşirlə yazmaq, şəkil çəkmək və ya tablolar asıb çıxarmaq kimi yorucu işdən azad olur (Nəbiyeva, 2011). İKT avadanlığının, o cümlədən interaktiv lövhənin, kompyuterin, proyektorun quraşdırılması, əks əlaqəli multimediyalı auditoriyanın təşkili ilə virtual sinif otaqlarının yaradılması problemin həllinə kömək edir. Elektron kitabxanaların yaradılması isə müəllimlərin hər bir dərslərində multimediyadan istifadə imkanlarını artırır (Qafarova, 2019).

Ümumtəhsil məktəblərində fənlərin, o cümlədən biologiyanın tədrisində müasir kompyüterlərdən əsasən aşağıdakı hallarda istifadə olunur:

- xüsusi öyrədici proqramlardan istifadə etməklə tədris prosesinin təşkilində;
- şagirdlərin bilik və bacarıqlarının yoxlanılması prosesində;
- bioloji proseslərin mahiyyətini başa düşmək üçün;
- laboratoriya işlərinin və təcrübəsinin aparılmasında;
- tədris prosesinin təşkilində;
- dərsdə motivasiyanın yaradılmasında;

- tətbiqi məsələlərin həll olunmasında;
- dərs vəsaitlərinin hazırlanmasında;
- resursların işlənməsində;
- sual və tapşırıqların hazırlanmasında;
- şagirdlərin bilik və bacarıqlarının qiymətləndirilməsində və s.

Tədris filmləri biologiya dərslərində effektli pedaqoji təlim vasitələrindən biridir. O, şagirdlərin diqqətini inkişaf etdirir, əyaniliyi möhkəmləndirir, digər tərəfdən mikro, makro və multi çəkilişlər hesabına hadisələrin izahına imkan yaradırlar. Bütün bunlar şagirdlərin hadisəni diqqətlə izləməsinə imkan yaradır. Həm də şagirdlərin təlim-tərbiyəsində böyük rolu vardır. Tədris filmindən istifadə edilməsində müəllimdən yüksək pedaqoji ustalıq tələb edilir. Belə ki, müəllimin hazırlığı və lazım olan anda filmdən istifadə etməsi şagirdlərin müəyyən hadisənin izahının dəqiqliymə aydınlıq gətirir. Habelə film vasitəsilə şagirdlər müəyyən praktik vərdişlərə yiyələnirlər. Tədris prosesində problemin həlli yollarından biri də internet resurslardan düzgün istifadə etməkdir. Internetdən olan resurslar içərisində ən maraqlısı VEB2 alətidir. VEB2 alətində yığılan dərslər daha maraqlı, daha zəngin, interaktiv olması ilə seçilir. Ən zəif şagird də dərs ilə maraqlanır. Ona görə də şagirdlər dərsi daha dərindən öyrənirlər.

Milli kurikulum dərslərdə İKT-dən geniş istifadəni nəzərdə tutur. Kompüterdən, proyektordan istifadə etməklə mövzunun icmalı qabaqcadan hazırlanır. Motivasiyanın qurulmasında mövzuya aid materiallardan internet qaynaqlarından, fləşkartlardan, əyani vəsaitlərdən, videomateriallardan, slaydlardan, animasiyalardan və s. istifadə etməklə şagirdlərin diqqətini maksimum dərəcədə dərsə cəlb edilir. Biologiya dərslərində təbiət hadisələrini, heyvanları, bitki ötüyünü və s. əks etdirən video materialların nümayişi şagirdlərdə dərslərə daha böyük maraq oyadır və onlarda mövzunun öyrənilməsinə həvəs yaradır. Bundan başqa şagirdlər tədqiqat apararkən, ümumi nəticələr çıxararkən daha dəqiq, daha səlis işləyir, dərslər bu günkü tələblərə uyğun daha fəal, daha canlı keçir (Kərimov, 2007).

İKT-nin metodiki işdə uğurla tətbiq olunması müəllimin İKT-nin tətbiqi bacarıqlarına əsaslanır. O, İKT-dən istifadənin müxtəlif formalarını yaxşı bilməli kompyuterdə səmərəli işləməli, əsas təhsil slaydlarını hazırlamalı, təqdim etməlidir. İKT vasitəsi ilə səs, mətn, şəkil, animasiya, video kimi məlumatları əldə etmək mümkündür: Tərcümə proqramları: dilmanc, poliqlot, linqvo, Google trandslate. Fənn üzrə toplanmış informasiyanın elektron vasitələrlə ana dilinə çevrilməsi və istifadəsinə imkan yaranır. Fənn tədris olunan zaman elektron lövhə, printer, skayner kimi qurğular təlim prosesinin effektli aparılmasını təmin edir (Gubin, 2023).

Müəllimin İKT-dən istifadə bacarıqlarına aiddir:

1. Şagirdlərin bilik və bacarıqlarının qısa vaxt ərzində qiymətləndirilməsi.
2. Konkret internet resurslarının müəllimin metodiki tapşırığı əsasında öyrənilməsi
3. Lazımı məlumatın azad, geniş zolaqlı şəkildə axtarılması;
4. Dünya təcrübəsi və biliklərinə yiyiələnməni təmin etməsi.

İKT sayəsində şagird problemi həll etmək üçün onu araşdırır, həm də müxtəlif proqramlardan istifadə etməklə ümumi məqsəd ətrafında birləşdirir, əldə etdiyi bacarıqları ümumiləşdirərək bacarıqlarını nümayiş etdirir. Bütün bunlar onlarda tədqiqatçılıq bacarığını formalaşdırır (Nəbiyeva, 2011).

Tədrisdə İKT-dən istifadədə bir sıra çatışmazlıqlar özünü göstərir:

1. Şagirdlər arasında əməkdaşlığın pozulması;
2. Şagirdlərə qarşı inamsızlığın yaranması (verilən tapşırığın cavabı zamanı);
3. Müəllim şagird arasında ünsiyyətin azalması;
4. Bəzi məlumatların yetərsizliyi və müəllimin izahına ehtiyacın yaranması;
5. Sağlamlığa mənfi təsiri;
6. Kitaba marağın azalması və s.

İKT-dən istifadə edilməsi müəllimə pedaqoji elmlərin, o cümlədən biologiyanın tədrisinin inkişaf tendensiyalarını izləməyə imkan verir. Onun peşəkar səviyyəsini yüksəltməyə,

dünyagörüşünü artırmağa, ən əsası isə bioloji biliklər bazasının genişləndirməsinə, sistemləşdirməsinə, dərsliklərlə sərbəst işləməsinə, əlavə informasiyalar toplanmasına kömək edir.

Hər bir müəllim öz biliyini, pedaqoji ustalığını arıtrmaq üçün daim axtarışda olmalı, İKT-dən geniş istifadə etməlidir.

## Ədəbiyyat

1. Abışov, N.Ə. (2011). Müasir İnformasiya-kommunikasiya texnologiyalarının tədris prosesinə tətbiqi. Monoqrafiya. Bakı: Elm, 208 s.
2. İbrahimova, X. (2005). Biologiyanın tədrisində fəal təlim metodlarının tətbiqi. Monoqrafiya. Bakı, «R.N.Novruz – 94», 160 s.
3. “Təhsildə Qloballaşma və İKT” mövzusunda konfrans materialları. (2008). Bakı, 79 s.
4. Bəşirova, Q.İ. (2009). Elektron təlim prosesində tədrisin kompyuter vasitəsi ilə idarə olunması. Bakı: Təhsildə İKT jurnalı. № 2, 111 s.
5. Nəbiyeva, Z. (2011). Təlim prosesində İKT-dən istifadə imkanları. (Metodik vəsait). Bakı.
6. Qafarova, P.M. (2019). Biologiyanın tədrisi metodikası (İKT materialları ilə). Dərs vəsaiti. Bakı, 66 s.
7. Kərimov, Y.Ş. (2007). Təlim metodları. Bakı: «RS Poliqraf», 272 s.
8. Gubin, M. (2023). IKT v obrazovanii, s.5-8.

Göndərilib: 13.12.2023 Qəbul edilib: 16.01.2024

DOI: https://doi.org/10.36719/2706-6185/31/22-25

**Aysel Abdullayeva**
Bakı Dövlət Universiteti
doktorant
aysel.nemetli1995@gmail.com

# MƏKAN ANLAYIŞININ LİNQVOKULTUROLOJİ ASPEKTLƏRİ

**Xülasə**

Müasir cəmiyyətdə kommunikativ proseslərin böyük hissəsi mədəniyyətlərarası ünsiyyətin payına düşür. Bu baxımdan vaxtlar çərçivəsində dil və mədəniyyət, mədəniyyətlərarası kommunikasiya, linqvokulturologiya məsələlərinə tədqiqatçıların marağı getdikcə artır. Linqvokulturologiyada məkan anlayışına xüsusi diqqət yetirilir. Onomastik leksika, xüsusən toponimlər böyük mədəniyyətşünaslıq potensialına malikdir. Məqalədə linqvokulturologiyada məkan konsepti anlayışları ətraflı izah edilir, düzgün qavranılması və ifadə olunması aydınlaşdırılır. Məkan anlayışlarının linqvokulturoloji konseptə çevrilməsi də digər anlayışlarda olduğu kimi eyni üsullarla gedir; belə ki, xalqın ideya- estetik istedadı, metaforik düşüncə məharəti, simvol yaratmaq qüdrəti səviyyəsində təzahür etməklə onun mental dünyasının təkrarsız mənzərəsini müəyyən edir.

***Açar sözlər:*** *mədəniyyətlərarası kommunikasiya, linqvokulturologiya, məkan, etnoloji etüd*

**Aysel Abdullayeva**
Baku State University
PhD student
aysel.nemetli1995@gmail.com

## Linguistic aspects of spatial perception

**Abstract**

Most of the communicative processes in modern society are intercultural communication. From this point of view, the interest of researchers in the issues of language and culture, intercultural communication, linguoculturalology is increasing. Special attention is paid to the concept of space in linguistics. Onomastic lexicon, especially toponyms, has great cultural studies potential. In the article, the concepts of space in linguistic culture are explained in detail, and their correct perception and expression are clarified. The transformation of spatial concepts into linguistic and cultural concepts follows the same methods as in other concepts; thus, by manifesting at the level of the people's idea-aesthetic talent, metaphorical thinking skills, power to create symbols, it determines the unique picture of their mental world.

***Keywords:*** *intercultural communication, linguoculturalology, space, ethnological study*

## Giriş

Dünyada müasir kommunikasiya prosesləri mühüm rol oynayır. Bir tərəfdən, sivilizasiyaların, digər tərəfdən, mədəniyyətlərin milli identikliyinin qorunub saxlanmasını şərtləndirən tendensiyalar geniş vüsət alır. Cəmiyyətdə, mədəniyyətdə, dildə hər iki tendensiya – xüsusiləşmə və unifikasiya eyni dərəcədə müşahidə olunur, aktuallıq qazanır. Dünyada kommunikativ proseslərin böyük bir hissəsi mədəniyyətlərarası ünsiyyətin payına düşür. Bu səbəbdən son vaxtlarda dil və mədəniyyət, mədəniyyətlərarası kommunikasiya, linqvokulturologiya məsələlərinə tədqiqatçıların marağı getdikcə çoxalır. XX əsrin sonu XXI əsrin əvvəllərində elmi paradiqmada köklü dəyişikliklər olmuşdu: dilin tədqiqi ilə bağlı bir neçə yeni ideyalar və yanaşmalar meydana çıxdı ki, bunlardan biri də linqvokulturologizmdir. Linqvokulturologizm xalqın dili ilə mədəniyyəti arasında sıx əlaqə və dilin inkişafının insanın yaradıcı fəaliyyətinin nəticəsi kimi başa düşülməsidir.

«Linqvokulturologiya» termini XX əsrin 90-cı illərində V.V.Vorobyova, V.A.Maslova, Y.S.Stepanov, V.N.Teliya və b. tədqiqatçıların əsərlərində meydana gəlmişdir. Linqvokulturologiya mədəniyyətin dildə inikasını öyrənən və mədəniyyət hadisələrinin araşdırılmasında dil materialından istifadə edən bir sahə kimi, həm xalqın altı tarixi və dilin diaxroniyası, həm də müasir dövr ilə bağlıdır. O, dil, etnik mentalitet və mədəniyyət arasındakı əlaqələrin üzə çıxarılmasına rol oynamışdır. Bu sahə dil və mədəniyyət əlaqələrinin yeni formalarının proqnozlaşdırılması üçün böyük potensiala sahibdir. Onun tədqiqat obyekti mədəni informasiyanın ötürücüsü kimi dilin, bu mədəniyyəti yaradan insanın qarşılıqlı əlaqəsidir. Mədəniyyətin fenomeni kimi dilə münasibət, onun bu mövqedən təsviri milli mentallıq əlamətlərinə, bu əlamətlərin onomastik leksikada, frazeologiyada, nitq etiketində, etik konseptlərdə inikasına diqqət tələb edir. Son zamanlarda linqvokulturologiyanı mədəniyyətlərarası kommunikasiya ilə bağlayan istiqamət formalaşmışdır. Mədəniyyətlərarası kommunikasiya fəal inkişaf edən, cəmiyyət tərəfindən tələb olunan nəzəri və tətbiqi elmi istiqamətdir. O, müxtəlif mədəniyyət nümayəndələrinin ünsiyyət proses və mədəniyyətlərarası qarşılıqlı əlaqə proseslərinin elmi tədqiqat sahəsidir.

Dildə məkan anlayışı özünün ən müxtəlif funksional təzahürlərində yalnız neytral informasiya ifadə etməklə qalmayıb həmçinin dil daşıyıcılarının – xalqın, millətin mental xüsusiyyətlərini aydın müşahidəyə, təhlilə gələn konkret faktlarla əks etdirir. Hər şeydən əvvəl onu qeyd eləmək lazımdır ki, coğrafiya etnosu təyin edən dörd və ya beş mühüm əlamətdən biridir (Cəfərov, 2016: 6). Bu isə o deməkdir ki, xalqın mentalitetində onun məskunlaşdığı, formalaşdığı məkan və ya məruz qaldığı yerdəyişmələr öz əksini tapmalıdır ki, burada dil bütün diferensial ideya- estetik potensialı ilə həmin mənəvi ehtiyacın xidmətindədir. İlk ixtisaslaşması etibarilə coğrafiyaçı olan məşhur etnosşünas L.N.Qumilyovun etnogenez nəzəriyyəsində aşağıdakı müddəalar mühüm yer tutur:

“Dünya yenilənmişdir, daim dəyişən coğrafi mühit və sosial sferanın inkişafı fonunda hər yerdə və həmişə yenilənmişdir. Bu qarşılıqlı təsirlərdə etnogenez öz rolunu oynayır: o, biosfera ilə sosiosfera arasında həlqədir”. Tarixi xronologiyaya müəllif “etnos- landşaft” sistemində baxır (Gumilev, 2015: 187).

L.Qumilyovun etnogenez nəzəriyyəsi heç də birmənalı qəbul olunmamış, vaxtaşırı haqlı-haqsız tənqidlərə məruz qalmışdır. Əlbəttə, biz bu mürəkkəb polemikanın bütün tərəflərinə müdaxilə etmək iddiasında deyilik, ancaq etnosun təfəkküründə məkan anlayışı və bunun dildə əksi məsələsinə yaxın olan bəzi məqamlara toxunacağıq. Söhbət, ilk növbədə, görkəmli etnosşünas-mütəfəkkirin “Rusdan Rusiyaya” kitabından, daha çox isə ona əlavə olan “Böyük avrasiyaçının vəsiyyəti” adlı son sözdən (müəllif Rusiya Coğrafiya Cəmiyyətinin prezidenti, professor S.B.Lavrovdur) (Гумилев Л.) gedir.

“Etnoloji etüdlər”də həmin son sözə artıq münasibət bildirilmişdir (Cəfərov, 2021: 35- 47). Orada göstərilir ki, “Lev Qumilyov ilk növbədə coğrafiya tarixçisi olduğundan onun əsərlərində (və nəticə etibarilə, məşhur nəzəriyyəsində qədim dövrlərdən başlayaraq yer üzündə zühur etmiş çoxsaylı etnosların tarixi, əgər belə demək olarsa, ehtirasla (öz termini ilə ifadə etsək, passionar bir maraqla!) araşdırılır ki, onların içərisində ən çox diqqət yetiriləni məhz türklərdir. ...Lakin onun rus-slavyanlarla monqol- tatarların “birləşərək” vahid superetnosa çevrilmələri – Avrasiya etnosunu yaratmaları mülahizəsi birbaşa desək, həqiqəti ifadə etmədi” (Cəfərov, 2021: 44).

“Etnoloji etüdlər” müəllifi N.Cəfərov “Vəsiyyət”də iki son dərəcə ciddi mübahisəli məqam aşkarlamışdır ki, onlardan birincisi L.Qumilyovun “Qədim türk tarixi”ndə türklərin tarixinin ilk orta əsrlərdən o tərəfə aparılmamasıdır. Halbuki beş min ildən artıq tarixi olan türkləri kifayət qədər cavan slavyanlarla belə asanlıqla birləşdirmək olmaz. İkinci məqam isə ondan ibarətdir ki, “Vəsiyyət” müəllifi Türkiyə türklərini Türk dünyasından ayıraraq Müsəlman superetnosuna daxil edir. Əlbəttə, bu, hüç cür özünü doğrulda bilməz. N.Cəfərovun fikrincə, türk dünyasının vahid etnoqrafik məkan olması nə nəzəri, nə də praktik olaraq şübhə doğurmur (Cəfərov, 2021: 46- 47).

Rus-slavyanlarla türklərin Avrasiya coğrafiyasındakı iqtisadi, sosial, siyasi və mədəni əlaqələrinə gəldikdə isə, bu, prinsip etibarilə, birtərəflidir. Təsadüfi deyil ki, son dövrlərin araşdırmalarında bu, kifayət qədər zəngin dəlillərlə əks etdirilir. “Mərkəzi Rusiyanın türk coğrafiyası” kitabının müəllifi M.Təkəli- Nuriyeva yazır:

"Şərqi slavyan xalqlarının, o cümlədən rusların mədəniyyəti və əxlaqi mənbəyinin formalaşması və gücləndirilməsidə, nəhayət, Rus dövləti quruculuğu işinin doğulması və qüvvətləndirilməsi sahəsində Türk dövlətçilik təcrübələri və dərsləri, böyük mədəniyyət təsirləri son dövrlər təkzibedilməz faktlarla təsdiqlənməkdədir. Artıq qəbul etmək lazımdır ki, Moskva şəhəri və ətrafı, habelə canlı danışıqda "Moskvaaltı" deyə qullanılan Moskva vilayəti... türk adları ilə zəngindir" (Təkləli – Nuriyeva, 2018: 7-8).

Türk dilinin ilk orta əsrlərdən, yəni Şərqi slavyanlar tarix səhnəsinə çıxandan onlara təsirinin miqyası barədə danışarkən görkəmli türkoloq N.A.Baskakovun bu sahədəki xidmətlərinin möhkəm bir fundament təşkil etmiş olduğunu etiraf edən müəllif göstərir ki, N.Baskakovun xüsusən "İqor alayı haqqında dastan"ın türk leksikası", "Türk mənşəli rus familyaları", "Moskva küçələrinin türk adları" və alimin Maks Fasmerin "Rus dilinin etimoloji lüğəti" üzrə rus dilindəki türk leksik alınmalarıyla bağlı silsilə məqalələri sovet dövründə yazılsa da, "tarixə nəfis, qayğıkeş, eyni zamanda ötkəm, vicdanlı müdaxilələr"dir (Təkləli – Nuriyeva, 2018: 9).

Rus dilinə küçən çoxsaylı türk həm xüsusi, həm də ümumi sözlərini araşdıran M.Təhləli linqvokulturoloji baxımdan maraqlı belə bir fakta da diqqət yetirmişdir ki, rus dilinə keçən bir sıra türk sözləri sonralar müasir türk dillərinə məhz "rus sözü" kimi (məsələn, piroq, jilet, stəkan və s.) qayıtmışdır (Təkləli – Nuriyeva, 2022: 8-9).

Beləliklə, L.Qumilyovun "Rusdan Rusiyaya" kitabında haqqında bəhs etdiyi, türklərlə Şərqi slavyanlar arasındakı geniş bir coğrafiyada uzun sürən əlaqələr tarixi faktdır, ancaq xüsusi olaraq qeyd etmək lazımdır ki, bu əlaqələr heç bir superetnos yaratmamışdır - əgər linqvokulturoloji materialın geniş spektrinə nəzər yetirsək, görərik ki, ruslar, ümumən Şərqi slavyanlar etnocoğrafi baxımdan müəyyən qədər qıpçaq türkləri ilə kontaktda olmuş, oğuz və karluq türkləri ilə ciddi, intensiv əlaqələrdə iştirak etməmişlər (Xəlilov, 2013: 258-259). Qıpçaq dillərinin, eləcə də xalqlarının coğrafi diferensiasiyası, yəni müxtəlif məkanlar üzrə paylanma – yayılma prosesi və buradan irəli gələn müasir mənzərəsi də belə bir nəticəyə gəlməyə əsas verir ki, burada hər hansı xarici etnik təsirin, o cümlədən də rus- Şərqi slavyan təsirinin rolu elə bir əhəmiyyət daşımamışdır.

Məkan anlayışının linqvokulturoloji aspektlərindən bəhs edərkən xüsusi olaraq nəzərdə tutmaq lazımdır ki, bu və ya digər məkan məhz dil vasitəsilə öz etnik- etnoqrafik rəngini, spektrini alır. Buraya, ilk növbədə, canlı danışıq dilinin – dialekt və şivələrinin yerləşməsi, ikincisi, toponimlər, üçüncüsü isə xalq ədəbiyyatının müxtəlif, eyni zamanda region üçün səciyyəvi janrları daxildir. Məsələn, istər Dağlıq, istərsə də Aran Qarabağa ermənilərin iddiaları ona görə cəfəngiyyatdan başqa bir şey deyildi ki,ümumən Qarabağın linqvokulturologiyasında erməni qatı yoxdur, müəyyən epizodik elementlər isə çox- çox sonralara aiddir. Həmçinin bugünkü Ermənistan Respublikası ərazisinin də sözügedən nöqteyi- nəzərdən qədim türk yurdu olması heç bir şübhə doğurmur.

Linqvokulturoloji araşdırmalarda məkan mentallığı elə bir stabil sistemdir ki, onsuz bu multidissiplinar sahəni təsəvvür etmək çətindir. Ümumiyyətlə, "klassik elmlərdən (məsələn, dilçilik, ədəbiyyatşünaslıq, tarixşünaslıq elmləri, fəlsəfi elmlər, psixologiya və s.) fərqli olaraq multidissiplinar istiqamətlər öz varlıqlarını məhz iddia etdikləri sahələrdəki mövcud problemləri aşkarlayıb həll etməklə göstərirlər. Və bu cür istiqamətlərin, o cümlədən də linqvokulturologiyanın uğurlarını çox zaman "kəşfiyyat" xarakterli nəzəri mülahizələr müəyyən edir" (Cəfərov, 2016: 149-150).

Linqvokulturologiyanın maraq dairəsinə, nəticə etibarilə, predmetinə aşağıdakı məsələlər daxil edilir:

1. "Dilin dərin qatlarında (şifahi, yaxud yazılı mətnlərdə) süxurlaşmış arxaik mədəni təfəkkür aktlarının – arxetiplərin aşkarlanaraq sistemli şəkildə araşdırılması problemi.
2. Bu və ya digər coğrafiyada yayılmış dil (nitq) proseslərinin cəmiyyətin mədəni xarakteristikası mövqeyindən öyrənilməsi problemi.
3. Linqvokulturoloji şəxsiyyət problemi" (Cəfərov, 2016: 150-151).

Bunların hər birində məkan təyinatı, yaxud coğrafi "qeydiyyat" xüsusi münasibətlər və ya asılılıqlar (funksiya) sistemi yaradır.

Arxetiplər həmişə bu və ya digər coğrafiya ilə bağlıdır, yəni ayrı- ayrı regionların linqvokulturoloji özünəməxsusluqları mövcuddur. Hətta bütöv bir dilin. yaxud xalqın miqyasında ortaya çıxıb, əgər belə demək mümkünsə, universal səciyyə daşıyan ümummilli arxetiplərdə, nəticə etibarilə, coğrafi əlamətlər daşımaqdadır. Eləcə də hər bir coğrafiyada yayılmış, müəyyən qanunauyğunluqlara malik dil (nitq) təzahürləri bu və ya digər cəmiyyətin mədəniyyətini özündə o şəkildə ehtiva edir ki, məhz dil (nitq) materialı, xüsusilə səciyyəvi konseptlər əsasında həmin mədəniyyətin sözün geniş mənasında təsvirini vermək mümkündür. Bu da öz növbəsində, haqqında söhbət gedən coğrafiyaya mənsub "dünya"nın "dil mənzərəsi"ni təsəvvür etməyə gətirib çıxarır. Nəhayət, linqvokulturoloji şəxsiyyət problemi də bu və ya digər dil (nitq) təzahürünün coğrafiyasından kənarda qalmır. Çünki şəxsiyyətin formalaşması dilin, onun təmsil etdiyi mədəniyyətin əsasında mümkündür (Gumilev, 2017: 808).

Məkan anlayışının linqvokulturologiyası dedikdə, əlbəttə, bu halda da istər dilin, istər mədəniyyətin, istərsə də cəmiyyət (insan) kontekst olmaqla onlar arasındakı əlaqələrin coğrafiyası fon olaraq qalır. Ancaq digər anlayışların linqvokulturologiyasından fərq özünü onda göstərir ki, əgər belə demək mümkündürsə, məkan konsepti məhz müəyyən məkan çərçivəsində nəzərdən keçirilir. Yəni bu və ya digər yaşayış məntəqəsi öz-özlüyündə məkandır, eyni zamanda o, hansısa daha geniş məkanda mövcuddur. Doğrudur, hər iki məkanın mental xüsusiyyətləri var, ancaq, birinci məkanla müqayisədə ikincinin (daha geniş məkanın) mentallığı daha miqyaslı, daha bütöv, bir etnosu ifadə etmək baxımından daha mükəmməldir (Qurbanov, 2019: 448).

Müşahidələr göstərir ki, məkan anlaışları dildə, əsasən, üç şəkildə təsbit olunur: 1) ümumi real məkan- bu o məkandır ki, ümumişlək sözlə ifadə olunur; məsələn: kənd, şəhər, aran, yaylaq, çöl, dağ, dərə və s.; 2) xüsusi real məkan – bu, o məkandır ki, xüsusi adlarla (toponimlərlə) ifadə olunur, doğrudur, heç də hər bir xüsusi məkan linqvokulturoloji rəngarəngliyə malik olmur, əsasən mərkəzi şəhərlər, xalqın tarixində əhəmiyyətli rol oynamış yaşayış məskənləri, dağlar, çöllər, dənizlər, çaylar müəyyən metaforik, simvolik məzmunla yüklənə, etnoqrafik təfəkkürdə önə çıxaraq mental dəyərlərə yiyələnə bilir; məsələn, azərbaycanlı üçün Bakı, Təbriz, Xəzər, Kür, Araz, Şahdağ, Qoşqar, Göygöl və s. 3)irreal məkan – bu o məkandır ki, cəmiyyətin təsəvvürlərində mövcud olur, başqa sözlə, onu insan təxəyyülü bu və ya digər məqsədlə, bu və ya digər problemi "həll etmək" üçün yaradır; məsələn: Xoşbəxtlər ölkəsi, Qaf dağı, cənnət, cəhənnəm, Çənlibel və s.

## Nəticə

Məkan anlayışlarının linqvokulturoloji konseptə çevrilməsi də digər anlayışlarda olduğu kimi eyni üsullarla gedir; belə ki, xalqın ideya- estetik istedadı, metaforik düşüncə məharəti, simvol yaratmaq qüdrəti səviyyəsində təzahür etməklə onun mental dünyasının təkrarsız mənzərəsini müəyyən edir.

## Ədəbiyyat

1. Cəfərov, N. (2016). Etnoloji etüdlər. Bakı: "Elm və təhsil", 108 s.
2. Gumilev, L. (2015). Ot Rusi do Rossii. M.: AYRIS – press., 320 s.
3. Cəfərov, N. (2021). Multidissiplinar dilçilik. Bakı: "Elm və təhsil", 180 s.
4. Təkləli-Nuriyeva, M. (2018). Mərkəzi Rusiyanın türk coğrafiyası. Bakı: "Zərdabi LTD" MMC, 280 s.
5. Təkləli-Nuriyeva, M. (2022). Türkoloji etüdlər. Bakı: ADPU nəş, 282 s.
6. Xəlilov, B. (2013). Türkologiyaya giriş. Bakı: "Bakı Çap Evi", 384 s.
7. Gumilev, L. (2017). Entsiklopediya. M.: "Khudozhestvennaya literatura, 808 s.
8. Qurbanov, A. (2019). Ümumi dilçilik. Bakı: AMEA, I cild, 448 s.

Göndərilib: 03.11.2023 Qəbul edilib: 23.12.2023

DOI: https://doi.org/10.36719/2706-6185/31/26-30

**Fərqanə Ağayeva**
Bakı Dövlət Universiteti
dissertant
guness@mail.ru

# MODAL SÖZLƏRİN QRAMMATİK-SEMANTİK XÜSUSİYYƏTLƏRİ HAQQINDA (“KİTABİ-DƏDƏ QORQUD” DASTANININ MATERİALI ƏSASINDA)

**Xülasə**

“Kitabi-Dədə Qorqud” dastanı Azərbaycan xalqının möhtəşəm abidəsidir. Dastan xalqın tarixini, dövlət quruluşunu, adət-ənənəsini əks etdirən bir mənbədir. Təəssüflə qeyd etmək lazımdır ki, ”Kitab” dilçilik nöqteyi-nəzərincə az tədqiq olunmuşdur. Köməkçi nitq hissələrinin, xüsusilə, modal sözlərin tədqiqata cəlb olunması aktuallıq kəsb edir. Məqalədə göstərilir ki, ”Kitab”da işlənən modal sözlər bir daha sübut edir ki, onlar dilin inkişafının sonrakı dövrünə məxsusdur, eyni zamanda, cümləyə müxtəlif məna çaları verməklə cümlənin semantik bütövlüyünü təmin edir. Dastanın dilində işlənən modal sözlərin sayı azdır. Onun tərkibində müasir dil cəhətdən arxaikləşən alınma modal sözlər də mövcuddur.

***Açar sözlər:*** *“Kitabi-Dədə Qorqud” dastanı, modal sözlər, qrammatik-semantik, sabit və qeyri-sabit modal sözlər*

**Fargana Aghayeva**
Baku State University
PhD student
guness@mail.ru

## About grammatical-semantic features of modal words (based on the material of the epic “Kitabi-Dada Gorgud”)

**Abstract**

"Kitabi-Dada Gorgud" epic is a great monument of the Azerbaijani people. Dastan is a source that reflects the history, state structure, and traditions of the people. Unfortunately, it should be noted that the "Book" has been studied little from the point of view of linguistics. It is important to involve auxiliary parts of speech, especially modal words, in the research.

The article shows that the modal words used in the "Book" once again prove that they belong to the later period of language development, and at the same time, they ensure the semantic integrity of the sentence by giving different shades of meaning to the sentence. The number of modal words used in the language of the epic is small. It also contains borrowed modal words that have become archaic in modern language. It also contains borrowed modal words that have become archaic in modern language.

***Keywords:*** *"Kitabi-Dada Gorgud" epic, modal words, grammatical-semantic, stable and unstable modal words*

## Giriş

“Kitabi-Dədə Qorqud” dastanı türk dünyasının əvəz olunmaz abidəsidir. Onun hərtərəfli filoloji sistemli tədqiqi olduqca aktualdır. Xüsusilə, “Kitabi-Dədə Qorqud” dastanında işlənən köməkçi nitq hissələrinin araşdırılması nədənsə diqqətdən kənarda qalmışdır. “Kitabi-Dədə Qorqud” dastanının dilində çox az sayda işlənmiş bir neçə köməkçi nitq hissəsi vardır ki, bunlardan biri də modal sözlərdir.

“Kitabi-Dədə Qorqud” dastanının dilində modal sözlərdən bəhs etmək türkologiyada mübahisə doğura biləcək problemlərdəndir. Belə ki, türk dillərində modal sözlərin varlığı bütün türkoloqlar

tərəfindən eyni cür qarşılanmır. Bəllidir ki, Türkiyə dilçiliyi, ümumiyyətlə, bu qrup sözləri nitq hissəsi kimi zərfə aid edir. Dünya dilçilik məktəbinin nümayəndələri olan türkoloqlar da modallığı türk dilləri üçün xüsusi bir kateqoriya hesab etmirdilər.

Modal sözlər haqqında və ümumiyyətlə, modallıq haqqında Azərbaycan dilçiliyində müxtəlif fikirlər mövcuddur (Hüseynzadə, 2007: 264; Rəhimov, 1965: 380; Müasir Azərbaycan dili, 1980: 240). Modal sözlər modallığın leksik ifadə vasitəsidir. Bildiyimiz kimi, modal sözlərin formalaşması, əsasən, 2 yolla: birinci, alınma sözlərin birbaşa modallıq semantikası ilə dilimizə keçməsi vasitəsilə; ikinci, başqa nitq hissələrinə aid leksemlərin modallaşması nəticəsində reallaşmışdır.

Modal sözlər və onun məna növləri Azərbaycan dilçiliyində ilk dəfə Ə.Cavadov tərəfindən tədqiq edilmişdir. Bu, Azərbaycan dilçiliyində ilk tədqiqatlardan biri olsa da, məsələnin qoyuluşu və həlli cəhətdən öz düzgünlüyü ilə diqqəti cəlb edir. Sonralar o, "Müasir Azərbaycan dili" kitabında "modal sözlər" bəhsini işləmiş və ilk məqaləsində qoyduğu məsələləri daha da inkişaf etdirmişdir (Müasir Azərbaycan dili, 1980: 461). Daha sonra F.Zeynalov Ə.Cavadovun fikirlərini davam etdirmişdir (Zeynalov, 1971: 215-261). O yazır: "Modal sözlərin əksəriyyəti əsas nitq hissələrindən lüğəti mənanın daralması, eyni sintaktik vəzifə ifa etmək yolu ilə təcrid olunur, köməkçi vasitə rolunu görməyə başlayır ... Modal sözlərin əsas nitq hissələrindən təcrid olunması yolu isə çox məhsuldar olub bu gün belə davam etməkdədir" (Zeynalov, 1971: 46). S.Abdullayeva bu fikri davam etdirərək qeyd edir: "*Modal sözlər son dövrlərdə yaranmış bir kateqoriya olduğu üçün hələ tam formalaşmamışdır. Modallığın leksik ifadəsi olan modal sözlər isim, sifət, zərf və feillərdən mənanın zəifləməsi və sintaktik vəzifənin dəyişməsi nəticəsində meydana gəlmişdir. Dilin qənaətə meyli və tabeli mürəkkəb cümlənin baş cümləsinin transformasiyaya uğraması prosesi də modal sözlərin əmələ gəlmə yollarındandır"* (Abdullayeva, 2012: 19).

Dilçilikdə belə qəbul olunmuşdur ki, modal sözlər morfoloji cəhətdən dəyişməzdir, sözyaratmada iştirak etmir, heç bir cümlə üzvü ilə əlaqəyə girmir.

Müasir Azərbaycan dilinin morfologiyasına aid ədəbiyyatda modallıq haqqında oxuyuruq: "*Danışanın söylədiyi fikrə, obyektiv reallığa münasibətini bildirən sözlərə modal sözlər deyilir... Leksik mənadan məhrumdur. Lakin başqa köməkçi nitq hissələrindən fərqli olaraq, leksik məna izlərini daha çox saxlamış olur və bu cəhətdən qoşma və bağlayıcılara, ədatlara nisbətən, əsas nitq hissələrinə daha yaxındır*" ("Kitabi-Dədə Qordud" dastanının qrammatik tədqiqi (fonetik, morfoloji və sintaktik təhlil), 2018: 379-380). Göründüyü kimi, Azərbaycan dilçiliyində modal sözlər kifayət qədər tədqiq edilmişdir. "Modal sözlər tarixən lüğəvi mənalı sözlərdən meydana gəlib, dilin müasir durumunda öz leksik mənasını itirmiş, heç bir morfoloji dəyiçikliyə məruz qalmayan, quruluşca sözə bərabər olan, obyektiv gerçəkliyin ayrı-ayrı cəhətlərini – zərurilik, ehtimal, mümkünlük və s. planda əks etdirərək danışanın ona modal münasibətini bildirən söz qrupudur" (Eyvazov, 2015: 136).

Modal sözlər, yuxarıda qeyd etdiyimiz kimi, müxtəlif nitq hissələrindən təcrid olunaraq formalaşmışdır. Bu sıraya adlardan*: qərəz, xülasə, sübhəsiz, düzü, doğrudan* və s.; feillərdən: *görünür, sanki, görək, görəsən, elə bil, sən demə, tutalım* və s. kimi modal sözlər aiddir.

Quruluşuna görə də modal sözlərə münasibət birmənalı deyil. Q.Kazımov modal sözlərin mürəkkəbliyini və düzəltmə olduğunu şərti olaraq qəbul edir və bildirir "*Bu sözlər modallaşaraq şəkilçi qəbul etməyiblər, şəkilçi qəbul edərək modallaşıblar*" (Kazımov, 2010: 383).

Qeyd edək ki, sözlərin modallaşması tam başa çatmamış prosesdir. Bu səbəbdən bəzi sözlər tam sabit modal sözlər: *əlbəttə, sanki, məgər, guya, yəqin* və s; bəziləri isə qeyri-sabit modal sözlər hesab olunur: *görünür, deməli, deyəsən, sözsüz, şübhəsiz* və s.

Modal sözlər gerçəkliyə münasibətə görə bir neçə məna qrupuna ayrılır:

Yəqinlik bildirənlər: *əlbəttə, şübhəsiz, düzü, yəqin* və s.

Güman, ehtimal, şübhə bildirənlər: *bəlkə, bəlkə (də), ehtimal ki, deyəsən, demə* və s.

Bənzətmə, müqayisə bildirənlər: *sanki, elə bil (ki), guya (ki)* və s.

Nəticə bildirənlər: *xülasə, deməli, nəhayət, beləliklə* və s.

Təəssüf bildirənlər: *əfsus (ki), heyf (ki), təəssüf (ki) və s.* (Kazımov, 2010: 385).

Türkologiyada modal sözlərin qədim yazılı abidələrin dilində işlənməsinə yanaşmaların fərqli olması ilə diqqəti cəlb edir. Bir çox türk dillərinin tarixi qrammatikasına həsr edilmiş əsərlərdə modallıq anlayışı öz əksini tapmamışdır. H.Mirzəzadə modal sözlərə toxunaraq qeyd edir ki, əslində bunlar leksik-semantik təyinatla müəyyənləşən, bünövrəsindən məhz bu nitq hissəsinə aid lüğət vahidləri deyildir (Mirzəzadə, 1990: 378). Nəsimi adına Dilçilik İnstitutunun hazırladığı "Kitabi-Dədə Qorqud" dastanının qrammatik tədqiqi" əsərində dastanın dilində işlədilən aşağıdakı modal sözlər göstərilmişdir: *tutalım, ola, gərəkdir, əlbəttə, gərək* ("Kitabi-Dədə Qordud" dastanının qrammatik tədqiqi (fonetik, morfoloji və sintaktik təhlil), 2018: 374-377).

Qeyd edək ki, *gərək, əlbəttə, qətiyyən* və s. bir sıra modal sözlər türkologiyada, əsasən, zərf sırasında verilir. Əlbəttə ki, bu fikirlə razılaşmaq olmaz.

*Ola kim* və *böylə kim* isə bağlayıcılar sırasında verilmişdir. Doğrudur, bu leksemlərin əsas mənası *bəlkə* sözünə yaxınlaşır və Azərbaycan dilçiliyində dil tarixçiləri bu sözü, əsasən, modal sözlər sırasında verir, lakin bizim fikrimizə görə, dastanın dilində bu sözlərin tam modallaşmasından danışmaq tezdir. Göründüyü kimi, bu sözlər bağlayıcı olaraq tədricən modallığa yaxınlaşır: "*Oğlana qorxunc xəbərlər verəyim, ola kim, getmiyə, dönə"*. Və ya başqa bir nümunə: "*Ola kim, bir ağzı dualının alqışilə Tənqri bizə bir yetman əyal verə, - dedi"*.

Dastanın dilində bir çox leksemlər işlənmişdir ki, bunları sabit modal sözlər adlandırmaq olar: *əlbəttə, əlhasil* və s (Şükürov, 1981: 96).

*Əlbəttə* modal sözü. *Əlbəttə* modal sözü ərəb dilindən alınmadır. Dastanın dilində iki variantda: *əlbəttə* və *əlbətdə* kimi işlənir. J.Deni bu söz haqqında təsdiq və ya rədd bildirən zərflər sırasında danışır: *"Zərflərin təsdiq və ya rədd növləri ərəb və ya fars dilindən alınmışdır. Xeyr, bəli, əlbəttə* və ya *əlbətt. Xalq ağzında həlbəttə və ya həlbət şəklində də işlədilir"*.

Biz artıq Azərbaycan dilçiliyində qəbul edilmiş təsnifə əsasən bu sözü sabit modal sözlər sırasında verdik. Məna qrupuna görə yəqinlik, təsdiq, razılıq bildirən leksem dastanın dilində bir neçə yerdə işlənmişdir. Məsələn: *Əlbətdə, tayım Uruz mana gəlsün,-dedi* (Abdullayev, 2016: 341); *Çünki dedün əlbətdə varsam gərək. Yok, əlbətdə öldürsəm, gərəkdür* (Abdullayev, 2016: 267); "*Əlbətdə, ol adam tutulan qələyə varmıyanca olmazam", - dedi* (Abdullayev, 2016: 327); *Çünki dedün, əlbətdə varsam gərək. Yok, əlbətdə öldürsəm, gərəkdür* (Abdullayev, 2016: 267).

Nümunələrdən göründüyü kimi, *əlbəttə* sözü tam modallıq bildirir. Bu söz hər hansısa bir sözlə dastan dilində sinonimlik yarada bilmir. Belə ki, dastan dilində modallıq semantik-funksial baxımdan passiv olduğundan və sözlər tam modallaşmadığına görə sinonim və omonim sözlərə rast gəlinmir. Yalnız bir yerdə təkrar kimi verilir və mənası mütləq, vacib mənalarına yaxınlaşır:

*"Əlbətdə* və *əlbətdə, Qazan bəg mana yetişsün, - dedi*" (Abdullayev, 2016: 317).

*Əlaqibət* modal sözü. *Əlaqibət* modal sözü ərəb mənşəli olub, yekun, nəticə bildirir. Məsələn: "*Əlaqibət, uzun yaşın ucı ölüm, axırı ayrılıq"* (Abdullayev, 2016: 346).

*Əlaqibət* modal sözü dastanda tək bir yerdə işlənmişdir. Bu söz artıq müasir dilimiz üçün arxaik hesab olunur. Görünür, dastan yazıya köçürüldüyü zaman işləkliyi güclü olmamış, zamanla da tamamən arxaikləşmişdir. Bu söz Dastanda semantik-funksional baxımdan məhdud şəkildə işlənir və *sonda, sonunda, nəhayət* mənalarında təsadüf olunur.

*Olmaya* modal sözü. Bu söz güman, ehtimal, şübhə bildirən modal sözlərə aid edilə bilər. Milli mənşəli, feil əsaslı modal sözdür. Dastanın dilində *olmıya* variantında qeydə alınmışdır: "*Olmıya kim, bu ola"* (Abdullayev, 2016: 240).

*Sanki* modal sözü. *Sanmaq* feilindən yaranmışdır. Ehtimallıq münasibəti mənasında işlənir. Dastanın dilində modallıq funksiyasında az yerdə işlənmişdir.

*"Sanasan kim, tar yolda tolu düşdi"* (Abdullayev, 2016: 264).

Nümunələrdən də göründüyü kimi, Dastanın dilində *sanki* sözünün az işlənməsinə baxmayaraq, artıq o dövr üçün də modallıq funksiyası qazanır və leksik-semantik baxımdan modal söz hesab olunur. N.Cəfərov dastanda işlənən bu sözlə bağlı yazır: "*Sandı kim feili sanasan kimə nisbətən daha müstəqildir: şəxs əlamətinin qeyri-müəyyənlik (əslində bu qeyri-müəyyənlik də deyil, nə isə mücərrəd bir anlayış verir) bildirməsi ilə "sanmaq" feilində semantik boşalma gedir.* Daha sonra alim davam edərək yazır ki, *bu proses belə bir praqmatik inkişaf yolu keçir: Elə sandı kim...*

*Sanasan kim ... San kim... Sanki... Beləliklə, bütöv cümlə strukturu morfoloji kateqoriyaya – köməkçi sözə çevrilir"* (Cəfərov, 1999: 92).

T.Hacıyevə görə, "*sanasan forması sanmaq feilinin arzu şəklinin ikinci şəxs təkidir, güman intonasiyası ilə işlədilərək feil məzmunundan təcrid olunur və güman münasibəti bildirir"* (Hacıyev, 1989: 244).

Q.Kazımov dastanda işlənmiş *elə bil kim* anlamlı *sanasan kim* sözünün və ümumən bu tip vahidlərin təkcə morfoloji yox, həm də sintaktik xüsusiyyətlərini müəyyənləşdirir: *"Ara sözlər o sözlərlə ifadə olunur ki, onlar modallaşmaqda, modal söz keyfiyyətini qazanmaqdadır, lakin hələ öz həqiqi mənasını o qədər də itirməyib; məsələn sanasan kim elə bil ki mənasını verməklə yanaşı, sanmaq feilinin mənasını da tam itirməmişdir"* (Rəhimov, 1965: 513). Yaxud da M.Rəhimov *ola kim* tərkibinin *bəlkə* mənasına uyğun gəldiyini söyləyir və *-a, -ə* ilə işlənmiş sözlərin (*xoş ola, aça* və s.) isə arzu deyil, güman məzmunu ifadə etdiyini qeyd edir (Rəhimov, 1965: 83).

Ə.Tanrıverdi nəticə, yekun bildirən modal sözlər sırasında *axırı, əlhasil, əlaqibət* kimi sözləri vermişdir (Tanrıverdi, 2012: 365).

*Əlhasil* modal sözü. Ərəb dilindən alınma olan söz funksiyasına görə modal sözdürdır. İşlənmə tezliyi məhduddur. Mənası *nəhayət* semantikasına uyğundur.

*"Əlhasil, ikisi bilə vardılar"* (Abdullayev, 2016: 345). "*Əlhasil, Oğuz yedi kərrə ürkdi* (Abdullayev, 2016: 304).

Göründüyü kimi, bu söz dastan dilində də məhdud çevrədə işlənmiş və müasir dilimiz üçün arxaikləşmişdir. Semantik-funksional rolu məhdud olduğundan və modallaşma prosesi həmin dövr dil normaları üçün çox yeni olduğundan sinonim cərgə yaratmamışdır.

*Tutalum/ dutalum* sözü, həqiqətən də, dastanın dilində işlənmişdir, lakin birbaşa feil kimi işlənmiş, semantikasında dəyişiklik baş verməmiş, söz modallıq qazanmamışdır: "*Gəlün varalum, dedi, tutalum.* Bu söz dastanda iki yerdə işlənmişdir.

*Baban gəldi, "tutalum" deriz* (Abdullayev, 2016: 268). *Gəlün Dirsə xanı tutalum, ağ əllərin ardına bağlayalım* (Abdullayev, 2016: 219).

Nümunələrdən göründüyü kimi, *tutalum* sözü heç bir halda modallığa yaxınlaşmır. Birbaşa semantik-funksional baxımdan feildir və cümlənin xəbəridir.

*Məgər* modal sözü. Dastanın dilində *məgər* sözünün *beləliklə* mənasında modal sözü kimi işlənməsi hallarına tez-tez təsadüf edilir:

*Məgər, xanım, Bayındır xanın bir buğası vardı, bir dəxi buğrası vardı* (Abdullayev, 2016: 213); *Məgər ol dəm Bayındır xan bəglər ilə seyrana getmişlərdi* (Abdullayev, 2016: 304); *Məgər, sultanım, oğlan ol arada yıqılmışdı* (Abdullayev, 2016: 217); *Məgər tayısı Əmən ol arada yaqın idi* (Abdullayev, 2016: 299). *Məgər, sultanım, genə yazın buğayı saraydan çıxardılar* (Abdullayev, 2016: 213); *Məgər, xanım, ol gecə Qalın Oğuzun dövləti, Bayındır xanın göygüsü, Ulaş oğlı Salur Qazan qara qayqılu vaqeə gördi* (Abdullayev, 2016: 225).

Bu nümunələrdə *məgər* sözü *sən demə, demə* modal sözü mənasına uyğundur.

*Gərək* modal sözü. Dastan dilində işlənən *gərək* sözü də maraq doğurur. *Gərək* sözü müasir dilçilik baxımından bəzən *sən demə, demə* anlamında işlənir və modal söz sayılır. Lakin dastan dilində işləndiyi bütün məqamlarda özünü modal söz kimi göstərmir. Verilən statistikadan da bəlli olur ki, dastan dilində 24 dəfə *gərək*, 4 dəfə *gərək-gərək* bağlayıcısının tərkibində, 3 dəfə *gərəkdür* şəklində, 7 dəfə *isə* ədatı ilə, 1 dəfə *gərəklüdür* şəklində işlənmişdir. Dastan yazıya köçürüldüyü dövr üçün bir əsərin dilində *gərək* sözünün bu qədər mənalarda işlənməsi maraq doğurur. Nümunələrə müraciət edək: "*Böylə, oğul, sənin neyne gərək"*. Dirsə xan boyunda bu cümlə 2 yerdə işlənmişdir (Hüseynzadə, 2007: 280).

Nümunələrdən göründüyü kimi, söz birbaşa nominativ mənaya malik söz kimi öz leksik-semantik mənasında işlənmişdir, predikativ söz kimi cümlənin xəbəri vəzifəsində işlənir. Gerçəkliyə zərurilik münasibəti bildirmir.

*Bəglər, bilürmisiz, Qazana necə heyf eyləmək gərək? Boyu uzun Burla xatununı gətürib sağraq sürdürmək gərək - dedi* (Abdullayev, 2016: 229). Göründüyü kimi, bu cümlədə 2 yerdə işlənmiş söz birbaşa öz mənasındadır və *lazımdır, yaxşı olar* sözlərinə yaxın məna kəsb edir.

Bununla bağlı istədiyimiz qədər nümunə verə bilərik, söz dastanın dilində aktiv işləkliyə malikdir, lakin sözün tam olaraq modallaşmasından danışmaq elmi məntiqə sığmır. *Qurt xəbər versə gərək!?* (Abdullayev, 2016: 227); *Köpək qaçan xəbər versə gərək!?* (Abdullayev, 2016: 227); *Su qaçan xəbər versə gərək!?* (Abdullayev, 2016: 226). Salur Qazan xanın evinin yağmalandığı boyda 3 yerdə işlənmiş *gərək* sözü, həqiqətən də, modallığa yaxın bir semantika daşıyır. *Gərək* sözünün işlənmə tezliyi yüksək olsa da, bu söz dastanın dilində həm ədat, həm də modal söz kimi özünü göstərir.

*Vallah* modal sözü. *Vallah* modal sözü ərəb mənşəlidir. Dastanın dilində 11 dəfə işlənmişdir. Bu söz yəqinlik ifadə edir. Məsələn:

*"Vallah, sultanım, bu yigit yüzı niqablu yaxşı yigitdir"* (Abdullayev, 2016: 240).

Modal sözlər sırasında mənbə bildirən sözlərin olmamasını Ə.Tanrıverdi aşağıdakı kimi əsaslandırır: *"Fikrin mənbəyini bildirən məncə, bizcə, fikrimizcə, zənnimizcə tipli modal sözlərə abidələrimizin dilində rast gəlinmir. Heç şübhəsiz ki, bu tipli modal sözlərin yaranması üslubların inkişafı ilə bağlıdır"* (Tanrıverdi, 2012: 365).

Modal sözlərin dildə azlığı onların dastan dilində aktivliyinə də təsir etmişdir. Aşağıda "Kitabi-Dədə Qorqud" dastanında bəzi alınma modal sözlərin işləndiyi səhifələr göstərilmişdir. Məsələn:

*Əlbəttə* (Abdullayev, 2016: 284-294-317-327-343); *əlhasil//əlhasili* (Abdullayev, 2016: 345-308); *əlaqibət* (Abdullayev, 2016: 346).

## Nəticə

Dastan dilinin araşdırılması sübut edir ki, həmin dövrdə bütün köməkçi nitq hissələri kimi, modal sözlər də tam formalaşmamışdır, lakin artıq aktivlik qazanmağa başlamışdır. Birmənalı şəkildə, dastanın dilində az da olsa, modal sözlər işlənmişdir. Fikrə münasibət bildirmək dastan dilində zəifdir. Müasir Azərbaycan dili üçün səciyyəvi olan modal sözlər, məsələn, *tutalım,* dastan dilində modal söz kimi yox, öz müstəqil mənasında çıxış etmişdir.

## Ədəbiyyat

1. Hüseynzadə, M. (2007). Müasir Azərbaycan dili. Morfologiya. Bakı: Şərq-Qərb, 280 s.
2. Rəhimov, M. (1965). Azərbaycan dilində feil şəkillərinin formalaşması tarixi. Bakı: EA, 266 s.
3. Müasir Azərbaycan dili. (1980). 3 cilddə. Bakı: Elm, c. 2, 510 s.
4. Zeynalov, F. (1971). Müasir türk dillərində köməkçi nitq hissələri. Bakı: Maarif, 312 s.
5. Abdullayeva, S.Ə. (2012). Modal sözlər haqqında bəzi qeydlər. "Azərbaycanşünaslığın aktual problemləri". III Beynəlxalq konfransın materialları. Bakı, 2-5 may, s.17-21.
6. "Kitabi-Dədə Qordud" dastanının qrammatik tədqiqi (fonetik, morfoloji və sintaktik təhlil). (2018). Bakı: Elm, 491 s.
7. Eyvazov, P. (2015). Azərbaycan və Türkiyə türkcəsində köməkçi nitq hissələri. Türkoloji araşdırmalar. Bakı: Elm və təhsil, s.67-147.
8. Kazımov, Q. (2010). Müasir Azərbaycan dili. Morfologiya. Bakı: Elm və təhsil, 398 s.
9. Mirzəzadə, H. (1990). Azərbaycan dilinin tarixi qrammatikası. Bakı: Azərbaycan Universiteti, 372 s.
10. Şükürov, Ə. (1981). Azərbaycan dilinin tarixi qrammatikası. Bakı: APİ, 96 s.
11. Abdullayev, K. (2016). "Kitabi Dədə Qorqud". Bakı: TEAS Press, 404 s.
12. Cəfərov, N. (1999). "Dədə Qorqud" eposundan "Kitabi-Dədə Qorqud"a. Eposdan kitaba. Bakı: Maarif, s.60-118.
13. Hacıyev, T. (1989). "Kitabi-Dədə Qorqud"da tabeli mürəkkəb cümlələrin natamam formaları. Azərbaycan dili tarixi məsələləri (Elmi əsərlərin tematik toplusu). Bakı, s.19-26.
14. Tanrıverdi, Ə. (2012). Azərbaycan dilinin tarixi qrammatikası. Bakı: Elm və təhsil, 464 s.

Göndərilib: 27.11.2023 Qəbul edilib: 08.01.2024

DOI: https://doi.org/10.36719/2706-6185/31/31-36

**Babək Allahverdiyev**
Milli Müdafiə Universiteti
Hərbi Elmi Tədqiqat İnstitutu
binnsc6@gmail.com
Adyunkt

# MÜHARİBƏ ANLAYIŞI VƏ MÜASİR MÜHARİBƏLƏR

**Xülasə**

Məqalə müharibə haqqında ümumi anlayışdan bəhs olunur. Eyni zamanda məqalədə müharibə nəzəriyyəsi haqqında qısa məlumat verilib. Həm çox öncəki zamanlarda, həm də müasir dövrdə aparılan müharibə növləri müqayisəli şəkildə təhlil edilmişdir. Müasir müharibələrin törədə biləcəyi böyük təhlükələr geniş şəkildə araşdırılmışdır. Müasir müharibələr arasında xüsusi önəm daşıyan hibrid müharibələrin hansı prinsip və qaydalara əsaslanması haqqında məlumatlar da məqalədə öz əksini tapmışdır. Məqalədə hibrid müharibədə tətbiq edilən güc və bir çox güc alətlərini eyni vaxtda sinxronlaşdırmaqla aktorların idarəçiliyində, aparılan döyüş elementlərinin dəqiq istifadə edilməsi bacarığından bəhs edilmişdir.

***Açar sözlər:*** *müharibə anlayışı, kiber muharibələr, müasir texnologiyaların müharibəyə təsiri, hibrid muharibələr, müharibə növləri*

**Babek Allahverdiyev**
National Defense University
Military Scientific Research Institute
Adjunct
binnsc6@gmail.com

## Concept of war and modern wars

**Abstract**

The article deals with the general understanding of war. At the same time, the article gave brief information about the theory of war. Both ancient and modern types of war were analyzed in a comparative way. The great dangers that modern wars can pose have been widely explored. Information about the principles and rules of hybrid wars, which are of special importance among modern wars, is also reflected in the article. The article talks about the power applied in hybrid war and the ability to use the combat elements accurately in the management of actors by synchronizing multiple power tools at the same time.

***Keywords:*** *concept of war, cyber wars, impact of modern technologies on war, hybrid wars, types of war*

## Giriş

**Müharibə -** dövlətlər, bloklar, siyasi qruplar və ya bir ölkə içərisindəki kütlələr kimi böyük gruplar və onların hərbi birləşmələri arasında hərbi əməliyyatlar formasında gedən münaqişələr olaraq bilinir. Dövlətlər arasında çətinləşən müəyyən məsələlərin həll edilməsi konteksində diplomatik missiyanın müvəffəq olmadığı hallarda nəticə əldə etmək məqsədi ilə ən az iki tərəf arasında silahlı qüvvə istifadə yoluyla şiddətə başvurma, bir tərəfin digər tərəfə öz möqeyini zorla qəbul etdirmə cəhdi və siyasətin başqa vasitələrlə davam etdirilməsi zərurəti kimi səbəblər müharibələrin baş verməsinə zəmin yaradır. Daha ayrıntılı bir təriflə desək müharibə, beynəlxalq sistemin əsas aktorları olan dövlətlər və ya onlar içərisindəki böyük kütlələr arasında şiddəti özündə cəmləşdirməklə aparılan iri həcmli münaqişə ya da çarpışmadır (1).

Müharibənin mənşəyi haqqında danışanda ilk öncə onun tarixi inkişaf formaları və tarixən mövcud analogiyalar barədə bəhs etmək lazımdır. Müharibənin tarixi inkişafı bilavasitə məhsuldar qüvvələrin və cəmiyyətin iqtisadi imkanları ilə birgə baş vermişdir. Bu məsələlər ilə bağlı tarixən müxtəlif fəlsəfi, ideoloji və siyasi fikirlər ilə yanaşı geniş iqtisadi baxışlar da mövcuddur. Lakin bu fikirlər və baxışları şərh etməzdən öncə müharibənin mahiyyəti, anlamı, tərifi, keçmiş və müasir analogiyaları və ümumilikdə təbiəti, xarakteri haqqında bəhs etmək vacibdir (Zamanov, 2017: 17).

Müharibə mövzusundakı tarixi və şüurlu müzakirələr, müharibədə stratejik düşüncənin təməllərini atan iki önəmli əsərlə başlanır. Bunların ilki Çinli hərbi general, strateq, filosof və hərb nəzəriyyəçisi Sun Tzu tərəfindən e.ə VI əsrdə yazılmış bir klassik əsər olan "Hərb sənəti"dir ki, müəllif bu kitabında müharibə zamanı əmr və idarəetmənin əhəmiyyətini araşdırır. Hər biri, müharibənin fərqli bir yönünü ələ alan on üç bölümdən ibarət bu şah əsər, taktika və strategiyaların təməl kitabı olaraq qəbul edilir.Müharibə ilə bağlı konseptual müzakirələri ələ alan bir digər klasik əsər isə Atinalı tarixçi və general Fukidid tərəfindən yazılmış beynəlxalq münasibətlər nəzəriyyələri arasında realizmin ilk yazılı əsəri sayıla bilən, Atina ilə Sparta arasında e.ə 431-404 illəri arasında baş vermiş və iyirmi yeddi il davam edən müharibələrin izah edildiyi "Peloponnes müharibəsi" başlıqlı kitabı müharibə ideyasının və müharibə strategiyasının əsaslarını qoyur. Prussiyalı general Karl Von Klauseviç "Müharibə haqqında" adlı əsərində müharibəni zorakılıq tətbiq edərək düşmənə tələblər qoyma hərəkəti olaraq təyin edir. K.V.Klauseviçin müharibə tərifi zorakılıq hərəkəti, düşməni müdafiəsiz qoyaraq istədiyimizi etməyə məcbur etmək məqsədi və bu məqsədə çatmağımıza imkan verəcək fiziki və psixoloji güc olmaqla üç hissədən ibarətdir: Müharibəni rasional və siyasi bir fenomen və siyasətin başqa bir formada aparılması kimi təyin edən K.V.Klauseviçdən bəri müharibə haqqında yazılar göstərir ki, müasir müharibələr bütün növ müharibə nəzəriyyələrindən daha sürətli formada dəyişir (Klauseviç, 1831: 18).

Mövzuya müharibənin tarixi dönüşümü istiqamətindən baxıldığında müasir dövlətlərin və müasir silahlar istifadə edən müasir orduların görünməyə başlandığı 15 may 1648-ci il tarixli Westfalya müqaviləsi ilə başlayan dövrün müharibələri, birinci nəsil müharibələr şəklində sinifləndirilməkdədir. Bu nəsil müharibələrdə yoğun atəş gücü yerinə insan gücü əsas taktiki ünsürdür və müharibələr vasitəsi ilə döyüş aparmayan kütlələr ayırd edilməkdədir. Bu dövr dünya siyasətinin həlledici doktrinası, "Güclər balansı" və bu çərçivədə balansı pozmağa çalışan ünsürlərlə birgə mübarizədir (Sokullu, 2019: 4). Dövrün sonu, yeni dövrün başlanğıcı Almanyanın Avropanı müstəqilliyi altına almaq məqsədi ilə imperialist xarici siyasət izləməsinin bir nəticəsi olan birinci dünya müharibəsidir. İkinci nəsil müharibələr ağır atəş gücünü özündə cəmləşdirən və geniş sahələrə yayılan müharibələrdir. Görməyərək atış ilə dəstəklənən düzünə atəş və hərəkət taktikasının aparaldığı bu nəsil mühəribələrdə, yoğun atəş gücünün dağıdıcı təsirindən faydalanmağı əsas götürən taktiki üsullardan istifadə olunmuşdur (Angstrom, 2005: 25-27). Üçüncü nəsil müharibəsi münbit hava şəraitində hazırlıqlı Ordu ilə sürətə, manevrə və düşmən qüvvələrinin müharibə ərazisində tam məhvinə əsaslanan və ikinci dünya müharibəsində almanlar tərəfindən istifadə edilən ildırımsürətli müharibə (Blitzkriq) ilə tarixə adını yazdırmışdır. Bu müharibə taktikası müharibə gedişinin ildırım sürətli aparılması məqsədi ilə XX əsrin əvvəllərində feldmarşal Alfred Fon Şliffen tərəfindən aparılmış gərgin hərbi kampaniyanın nəticəsində yaradılmışdı. İkinci dünya müharibəsi zamanı almanlar birçox dövləti eləcə də Polşanı, Danimarkanı, Norveçi, Niderlandı, Belçikanı və Fransanı bu müharibə taktikası ilə məğlubiyyətə düçar etmişdilər. Bu dövrdə yüksək texnologiya ilə yanaşı, hava qüvvələrinin elementlərinin tətbiqi də həmin bu müharibə taktikasının tərkib hissəsi olaraq xüsusi önəmə malik idi (Duyvestein, Angstrom, 2004: 9-11). Dördüncü nəsil müharibələr bütün siyasi, iqtisadi, sosial və hərbi şəbəkələrin birlikdə istifadə edildiyi şəbəkə mərkəzli, böyük iqtisadi və hərbi gücləri məğlub etməyi hədəfləyən və uzun müddət sürən, ictimai həyatın bütün sahələrini əhatə edən müharibələrdir. Bu müharibə nəslinə, rəqiblər tərəfindən çəkindirmə və balanslaşdırma siyasətinin izləndiyi və qarşıdurmaların qarşısının alınmasına xidmət edən diplomatik vasitə kimi yüksək inkişaf etmiş hərbi texnologiyalardan istifadə olunan soyuq müharibəni də misal kimi göstərmək olar. Ukrayna müharibəsi və Krımın ilhaqı, 11 sentyabr hücumları, baş vermiş bir sıra etnik münaqişələr və üsyanlar, terrorizm və

terrorizmlə mübarizə kimi müxtəlif hadisələr müharibələrin mahiyyətini dəyişdirmiş və bu fonda yeni müharibə növləri meydana gəlmişdir (Barston, 2019: 4-7). Bu gün müharibələr Birləşmiş Millətlər Təşkilatının müəyyən prinsip və qaydalarına əsaslanır.

Keçmişdəki müharibələrdən fərqli olaraq, bugünkü müharibələrin məqsədi dinc insanların öldürülməsinin qarşısını almaq, ölkəni və ya kütlələri məhv etmək əvəzinə zəiflətməkdir. Bu tip müharibələr müasir müharibələr adlanır və əvvəlki hərbi konsepsiyalardan, metodlardan və texnologiyadan əhəmiyyətli dərəcədə fərqlənir. Bu mühəribələrdə döyüşçülərin döyüş meydanındakı gücünü qorumaq üçün necə modernləşdirilməlisinin zəruriliyi yüksək önəm kəsb edir (Benbow, 2008: 1-6).

Müasir müharibənin yüksək texnologiyalardan geniş istifadə edilməsi ilə çox mürəkkəb hadisəyə dönüşümü artıq tarixin ən önəmli hissəsinə çevrilib. Müasir müharibə ekranın qarşısındadır. Əsgər ekrana baxır və lazımi düymələrə basmaqla tapşırığını icra edir. Artıq dövrümüzdə pilotsuz aparatlar mövcuddur ki idarəetmə yerlərindən aparılan məqsədyönlü fəaliyyət nəticəsində döyüş meydanında düşmən qüvvələri daha dəqiqliklə məhv edilir.

İkinci Qarabağ müharibəsi bugün müasir müharibələr üçün ən aktual nümunədir. Vətən müharibəsi olaraq tarixə düşən şanlı 44 günlük müharibəmiz cəmi altı həftə davam etsə də, itkilər baxımından postsovet bölgəsinin ən böyük müharibələrindən biridir. Rəsmi məlumatlara görə, müharibədə hər iki tərəfdən yeddi minə qədər döyüşçü və yüzdən çox mülki şəxs həyatını itirdi, qeyri-rəsmi statistikada isə itkilərin sayının on mindən çox olduğu bildirilir. Buna baxmayaraq, bir çox hərbi mütəxəssisin fikrinə görə, müharibədə ən müasir hərbi texnlologiyalardan İstifadə olunmasaydı, bu, daha çox insan itkisi ilə nəticələnəcəkdi. Bu müharibə tarixdə ilk dəfə olaraq pilotsuz uçuş aparatlarından istifadə edilərək hərbi məqsədlərə nail olunan müharibə kimi qiymətləndirilir və hərbi strategiyada çoxdan gözlənilən bir inqilab olaraq xarakterizə etdilir. Həqiqətən də bu, dövrümüzün yüksək texnologiyalı avadanlıqlarının əvvəlki dövrün adi silahlarına qarşı istifadəsi baxımından bir inqilab idi. Ənənəvi aviasiyaya nisbətdə pilotsuz uçuş aparatlarının daha üstün olduğu da bu müharibə ilə ortaya çıxdı. Müşahidəçilər arasında bir çoxu haqlı olaraq bu barədə qeyd edib deyirdilər ki: “Pilotsuz döyüş və kəşfiyyat təyyarələrinin ənənəvi aviasiyadan qat-qat ucuz olduğu məlum olsa da, bu, aviasiyanın pilotsuz uçuş aparatları ilə əvəz olunduğu ilk müharibə idi”. Məhz bu səbəbdən əksər dövlətlər bu müharibədən nəticə çıxararaq öz müdafiə strategiyalarını yenidən nəzərdən keçirdilər. Məsələn, bir qrup ABŞ hərbi mütəxəssisi, ABŞ dövlətinin 44 günlük müharibədən çıxara biləcəyi bir sıra dərslər müəyyənləşdiriblər. Onlar qeyd edirlər ki, ABŞ-ın və yaxın rəqiblərinin hərbi imkanları Azərbaycan və ya Ermənistandan çox fərqlidir, Buna görə də ABŞ Rusiya və Çin kimi əsas rəqiblərinin Cənubi Qafqazdakı kiçik respublikalar İlə eyni şəkildə mübarizə aparacağını gözləmir, lakin kiçik dövlətlər pilotsuz uçuş aparatları sayəsində məhdud şəraitdə taktiki hava üstünlüyünə nail ola bilərlər. Azərbaycanın müharibədə istifadə etdiyi hərbi taktika və strategiyalar, o cümlədən, burada sınaqdan keçirilmiş pilotsuz döyüş təyyarələri heç də hər kəs tərəfindən təhlükə kimi qəbul edilmir. Böyük dövlətlərlə münaqişədə olan kiçik dövlətlər üçün bu, daha qətiyyətli müdafiə siyasəti qurmaq üçün əla fürsətdir (Cəfərova, Huseynov, Bağırov, Hacıyev, Əsgərova, 2021: 23-25).

İndi yüksək inkişafın hökm sürdüyü həyatımızda müharibə kimi xəbərlər gözlənilməz təsirlər yaradır. Əslində biz bir-birimizlə döyüşməkdənsə, bütün dünyanı məhv etməyə, nüvə silahına sarılmağa üstünlük veririk. Belə bir şəraitdə yavaş-yavaş gizli mübarizə mühiti yaranır. Artıq yaranmış bu yeni mühitdə demək olar ki, cəbhə müharibələri başa çatıb, eyni zamanda odlu silahdan istifadə məhdudlaşdırılıb. Daha çox pilotsuz nəqliyyat vasitələrindən istifadə edilməyə başlanılıb. Gələcəkdə müharibə tamamilə başqa bir sahəyə doğru gedir (Brooks and Wohlforth, 2007: 3-6)

Getdikcə ört-basdır edilən və gizli davam edən mübarizələr elə bir forma alır ki, cinayəti törədən şəxsin aşkarlanması hardasa mümkünsüz vəziyyətə gəlib çıxmaqla yanaşı, faili belə tapılmır. Bunlar gələcək müharibələrin bizim nəzarətimizdən kənarda olacağına işarələrdir. Bütün bunlar gələcəkdə bizi hansı müharibələrin gözlədiyinin xəbərçisidir. Müasir dövrdən əvvəl yaşayan əcdadlarımız müharibəni qılıncsız və kamansız təsəvvür edə bilmədiyi halda odlu silahların

əhəmiyyəti və sonradan bu müharibə anlayışındakı dəyişiklik şüurumuza yeni dəyişikliklər gətirdi. Bir çox insanın bildiyi kimi, pilotsuz uçuş aparatları bunun üçün bariz bir nümunədir. İndi başa düşürük ki, gələcəyimizi işğal edən terror təhlükə deyil, təhlükəli olan isə insan tərəfindən günbəgün inkişafı üçün əmək sərf edilən müasir silahlardır (Sokullu, 2014: 42-48).

Bu gün müharibələr zəka və yenilik üzərində qurulur. Dövlətlər texnoloji inkişafı həyatın bütün sahələrində, xüsusən də döyüş texnikalarında nəzərə almağa başlayıblar. Texnologiyanın təhlükəsi döyüş meydanında istifadə edildikdən, kəşfiyyat fəaliyyətlərinə cəlb olunduqdan və bütün dünyada terrorizmi və ya terror təşkilatlarını dəstəkləyən dövlətlərin texnologiyadan sui-istifadə etməsindən sonra üzə çıxdı. Beləliklə, sözügedən texnikalar ən təhlükəli döyüş növlərinə çevrildi. Bu müharibələr “uzaq müharibə” və ya “kiber müharibəsi” adlanır. Kiber müharibələr ölkələrin təhlükəsizliyi və sabitliyi üçün ənənəvi müharibələrdən daha çox təhlükə yaradır. Texnologiya, rabitə və kiber müharibələr arasında sıx əlaqə var. Müasir texnologiyanın gətirdiyi bu böyük inqilabi dəyişim terror təşkilatları arasında əlaqəni asanlaşdırmaq, hücumlarını əlaqələndirmək baxımından beynəlxalq sabitlik və bütün dünya əhalisi üçün təhlükə yaradır. Kiber terrorizmlə bağlı bu narahatlıqlar xüsusilə Amerika Birləşmiş Ştatlarında 11 sentyabr hadisələrindən sonra daha çox artıma səbəb olub. Müasir müharibələrin əsas tərkib hissəsi olan kiber mühit, terror təşkilatlarının istənilən təbəqəni məhv etməsi üçün onlara vura biləcəyi zərbə və hücum imkanlarını yaradır. Amerika Birləşmiş Ştatlarının Birləşmiş Qərargah Rəisləri Komitəsinin sədri Mark Milley 2017-ci ilin iyulunda Vaşinqtonda keçirilən simpoziumdakı çıxışı zamanı müasir döyüş meydanında bu dəyişikliyə diqqət çəkərək bu müharibə üsulunun fərqli olduğunu ifadə edirdi. Çünki dünya əhalisinin 80-90 faizi əhalinin sıx olduğu şəhərlərdə yaşayır. Paralel olaraq müharibələr indi səhralarda deyil, insanların sıx olduğu şəhər küçələrində gedir (Krishenbaum, 2020: 88). Elektron sistemlərə sızıb bu sistemləri sıradan çıxarmaqla və ya “Stuxnet” virusu kimi düşmənin elektron sistemlərinə viruslar göndərməklə müharibənin qazanılması istiqamətində yetərli səviyyədə nəaliyyət əldə edilməsi mümkündür. Kiber mühit artıq döyüş meydanına çevrilib. Stuxnet virusunun 2010-cu ildə İranın nüvə proqramına ziyan vuraraq böyük çətinlik yaratması və bu nüvə proqramının iki il geriyə salınması haqqında məlumatı Alman kompüter mütəxəssisi Ralph Langer də öz ifadəsi ilə həmin ildə təsdiq etmişdi. Eləcə də, kompüterlərin və internetin bütün sahələrə nüfuz etməsi texnologiyanın təhlükəsini artırmışdır. Məhz, informasiya sistemləri daha da inkişaf etdikcə bəzi sahələrdə mənbənin öyrənilməsi çətinləşib. Bundan əlavə, rabitə, elektrik və su sistemlərinə müdaxilə edilə və bu sistemlər nəzarət altına alına bilər. Bu yolla ölkələrin sistemlərini virtual olaraq idarə etmək mümkündür. Bu səbəbdən bəzi dövlətlər terror aktları törədən qrupların səylərini ifşa etmək və onları puça çıxarmaq üçün müəyyən ağıllı cihazlar, aparatlar icad etməyə üz tuturlar. Terrorizmə qarşı beynəlxalq kampaniyalara və qlobal təşkilatların fəaliyyətinə baxmayaraq, terrorun kökünü kəsmək üçün səylər hələ də davam edir. Çünki terroru maliyyələşdirən partiyalar, hətta dövlətlər var (Goertz and Lavy, 2007: 237-260).

## Nəticə

Nəticə etibarı ilə, xarici siyasət aləti kimi müharibə bəşər tarixi qədər qədim bir fenomendir. Müharibələr tarix boyu texnoloji inkişafın təsiri altında məqsədlərinə, əhatə dairəsinə, səbəblərinə və növlərinə görə dəyişməyə davam edir. Müasir müharibələrin aparılmasında hibrid döyüş növü böyük rola sahibdir ki, çoxsaylı uçuş aparatları və döyüş maşınları kompleks şəkildə müəyyən bir məqsəd üçün birbaşa və ya gizli şəkildə istifadə edilir. Hibrid müharibənin aşkar və ya gizli həyata keçirilməsi üsulları çox müxtəlifdir və əsasən XXI əsrdə ortaya çıxan yeni texnika və kommunikasiya metodlarından istifadə etməklə baş verir. Bu baxımdan hibrid müharibə müasir müharibə növüdür. İndi hibrid müharibələr adlandırılan yeni nəsil müharibələrində aktorlar əsasən dövlətlər deyil və başqa tərəflərcə də aparılmaqdadır. Bu günə qədər hibrid müharibəyə bir çox təriflər verilib. Adi və partizan müharibəsinin qarışığı hibrid müharibənin ən mərkəzi təriflərindən biridir. Bu tərif ətrafında başqa təriflər də hazırlanmışdır. Birinci və ikinci dünya müharibələri zamanı on milyonlarla insan həlak oldu, yüz milyonlarla insan yaralandı, böyük müharibələri müəyyən qədər təxirə saldı. İkinci dünya müharibəsindən sonra şahidi olduğumuz hər bir münaqişə

müəyyən mənada məhdudlaşdırılıb. Koreya və ya Vyetnam kimi kiçik müharibələr buna misaldır. Dünyanın müxtəlif yerlərində bəzi partizan müharibələri, mənfur terror fəaliyyətləri və ya separatçı hərəkətlər baş verir. Bu məzmunda ilk təriflərdə hibrid müharibə sadəcə terror, partizan üsyanı və siyasi təbliğat olaraq görülsə də, zaman keçdikcə bu konsepsiya bir çox fərqli metoda əlavə edilərək inkişaf etdirildi. Bu gün ABŞ-ın müharibə ədəbiyyatında hibrid müharibə "ortaq effektlərə nail olmaq üçün bütün sosial funksiyalar spektrində xüsusi zəifliklərə, uyğunlaşdırılmış çoxsaylı güclərin sinxron istifadəsi" kimi ifadə edilir (Hammes, 2004: 40-44).

Rus politoloqu E.Koribko hibrid müharibəni "geostrateji tranzit zonalarda tarixi, etnik, dini, sosial-iqtisadi və coğrafi fərqlərdən istifadə edən xarici kimlik münaqişələri" kimi tərif edir. ABŞ və Rusiyanın tərifləri arasında bəzi fərqlər olsa da, hibrid müharibəsi ümumiyyətlə qeyri-qanuni müharibəni saxta xəbərlər, diplomatiya və kənar seçki müdaxiləsi kimi digər təsir edici üsullarla birləşdirən hərbi strategiyaları nəzərdə tutur. Bu kontekstdə hibrid müharibə ənənəvi hərbi birləşmələr, taktika və strategiyalarla yanaşı partizan, hərbiləşdirilmiş strukturlar və həmçinin nizamsız hərbi qüvvələrin fəaliyyətə cəlb olunması kimi vasitələrdən də istifadə edir.

Növbəti mərhələdə hibrid müharibənin əhatə dairəsi "iki ordu arasında birbaşa baş verməyən" bütün müharibələrə aiddir. Bunlara etnik, dini və ya milli zəifliklərdən istifadə edən psixoloji hücumlar, düşmən xəttinin arxasında fəaliyyət göstərən təxribatçılar, sanksiyalar, boykot və cəza tarifləri vasitəsilə iqtisadi hücumlar, düşmən iqtisadiyyatını zəiflətmək üsulları, seçkilərə və müxtəlif referendumlara kiberhücumlar daxildir (Holsti, 2003: 27-31). Hibrid müharibədə güc, bir çox güc alətlərini eyni vaxtda sinxronlaşdırmaqla aktorların idarəçiliyində, aparılan döyüşün gizliliyində, asimmetrik təbiətində və döyüş elementlərinin dəqiq istifadə edilməsi bacarığındadır.

Hibrid müharibə nəzəriyyəsinə göz atdığımız zaman bu mövzu üçün müharibə termini ilə bağlı təcrübəli məşhurlardan Prussiyalı general və hərbi nəzəriyyəçi Klauseviçin ifadəsini ələ alsaq "Hər dövrün öz müharibəsi, öz məhdudlaşdırıcı şərtləri və öz qərəzləri var". Rus generalı Gerasimov isə belə bir ifadə səsləndirirdi ki, "iyirmi birinci əsrdə biz müharibə vəziyyətləri ilə sülh dövlətləri arasındakı sərhədləri bulandırmağa meyilliyik". Hibrid müharibə nəzəriyyəsinə görə, artıq "real" müharibələrlə mübarizə aparmağın mənası yoxdur. Köhnə tipli müharibələr bu gün böyük və bərpası mümkün olmayan itkilərə səbəb olacaq. Bir ölkəyə ordu göndərərək, torpaq və ya sərvətləri ələ keçirməklə birbaşa müharibələr yerinə, "aparatlardan istifadə etməklə" dolayı mübarizələrə üstünlük veriləcək. Bu səbəbdən, hibrid müharibə bu gün əsgərlər və mülki şəxslər arasında aydın fərqin qarşısını alır. Eynilə, müharibə və sülh anlayışları da qeyri-müəyyənləşir (Watts, 2003: 5-9).

## Ədəbiyyat


1. https://www.globalvillagespace.com/what-is-hybrid-warfare-ikram-sehgal/
2. Zamanov, O. (2017). Müharibə, onun mənşəyi və öyrənilməsi. Bakı: Elm, 17 s.
3. Klauseviç, K.V. (1831). Müharibə haqqında. Kitab I, Fəsil I, 18 s.
4. Sokullu, E.C. (2019). Savaş türleri. Güvenlik yazıları serisi. İstanbul. № 22, 4 s.
5. Angstrom, J. (2005). Introduction: Discussing the Nature of Modern War, London. Frank Cass, pp.25-27.
6. Duyvestein, I., Angstrom, J. Rethinking the Nature of War. London. Frank Cass, pp.9-11.
7. Barston, R.P. (2019). Modern Diplomacy. London, Routledge, pp.4-7.
8. Benbow, T. (2008). Are you talking about our generation? "Evaluating the Concept of Fourth Generation Warfare", Comparative Strategy. London, Pearson, pp.1-6.
9. 44 günlük Qarabağ müharibəsi: mülahizə və nəticələr E.Cəfərova, V.Huseynov, O.Bagirov, Ş.Hacıyev, R.Əsgərova. Bakı: Elm, s.23-25.
10. Blechmann, B.M., Kaplan, S.S. (1978). Powers Without War: The US Armed Forces as Political Instruments. Washington D.C.: Brookings Institution. S.G.Brooks, W.C.Wohlforth (2007), s.3-6.
11. Goertz, G., Levy, J.S. (2001). Power, globalization and the end of the cold war: reassessing a landmark event for ideas, Explaining War and Peace: Case studies and Necessary Condition Counterfactuals. New York. Routledge, pp.195-235.

12. Sokullu, E.C. (2014). Transatlantic Public Opinion on War: Kosovo, Afghanistan and Iraq. Saarbrucken, LAP Lambert Verlag, pp.42-48.
13. Klausevich, K.V. (2007). On War (translated by P.Paret and M.Howard). Princeton, Princeton University Press, pp.21-23.
14. Krishenbaum, J. (2020). Modern warfare, London, Bloomsbury, 88 p.
15. Goertz, G., Levy, J.S. (2001). Power, globalization and the end of the cold war: reassessing a landmark event for ideas, Explaining War and Peace: Case studies and Necessary Condition Counterfactuals. New York. Routledge, pp.237-260.
16. Hammes, T.X. (2004). $4^{th}$ Generation Warfare: London, Our Enemies Play to Their Strengths Armed Forces Journal, pp.40-44.
17. Holsti, O. (2003). A return to isolation and unilateralism? American Public Opinion, Pre and Post-September 11”. Philadelphia, Proceedings of the Centennial Meeting of the American Political Science Association, pp.27-31.
18. Watts, S. (2003). Asymmetric Warfare: Threat and Response in the Twenty-First Century. Cambridge: Polity, pp.5-9.

Göndərilib: 12.11.2023 Qəbul edilib: 10.01.2024

DOI: https://doi.org/10.36719/2706-6185/31/37-43

**Ayten Aghalarova**
Azerbaijan State Pedagogical University
heziyeva_ayten@yahoo.com

# HYPERBOLE AS A PERSUASIVE TOOL

## Abstract

Exaggeration used for emphasis is known as hyperbole in writing and speaking. Exaggerations that are clearly meant to highlight a point rather than be accepted literally are typically found in hyperbolic comments. The terms metaphor and irony have been linked to hyperbole. The similarities between hyperbole and them are acknowledged in the paper. Additionally, it highlights how hyperbole and the two tropes differ from each other. Hence, the study demonstrates that exaggeration is a distinct form of figurative speech that shouldn't be associated with any particular stereotype. This research demonstrates how hyperbole shares traits with generalization in addition to metaphor and irony. Oversimplification and generalization are not the same thing.

***Keywords:*** *hyperbole, persuasive language, emotional appeal, hyperbolic language, political rhetoric*

**Aytən Ağalarova**
Azərbaycan Dövlət Pedaqoji Universiteti
heziyeva_ayten@yahoo.com

## Hiperbola inandırma vasitəsi kimi

## Xülasə

Vurğu üçün istifadə edilən mübaliğəyə yazı və danışıqda hiperbola deyilir. Hərfi mənada deyil, bir məqamı vurğulamaq məqsədi daşıyan mübaliğələrə adətən hiperbolik şərhlərdə rast gəlinir. Metafora və ironiya terminləri hiperbola ilə bağlıdır. Məqalədə hiperbola ilə onlar arasındakı oxşarlıqlardan bəhs olunur. Bundan əlavə, hiperbolanın və bu iki məcazın bir-birindən necə fərqləndiyi vurğulanır. Beləliklə, tədqiqat göstərir ki, mübaliğə heç bir konkret stereotiplə əlaqələndirilməməli olan obrazlı nitqin xüsusi formasıdır. Bu araşdırma göstərir ki, hiperbola ümumiləşdirmə ilə yanaşı, metafora və istehza ilə də oxşar xüsusiyyətlərə malikdir. Həddindən artıq sadələşdirmə və ümumiləşdirmə eyni səciyyə daşımır.

***Açar sözlər:*** *hiperbola, inandırıcı dil, emosional cəlbedicilik, hiperbolik dil, siyasi ritorika*

## Introduction

Studying hyperbole as a rhetorical device in written texts has a long history. It was first examined in the context of rhetoric, which for many centuries served as the foundation for language study along with grammar. This framework included numerous figures of speech that were discussed since the time of the ancient Greeks. Numerous treatises on eloquence and expressive tactics attest to the fact that rhetoric was formerly connected to the exercise of power and persuasive discourse in antiquity. The study of figurative rhetoric has only lately moved into the realm of common, everyday language thanks to pioneers like scholars. The literature on exaggeration in spoken language is mostly devoted to studies of verbal irony and humour, and there isn't much research on hyperbole used in ordinary speech.

When someone uses hyperbole, they are using figurative language to express one thing while meaning another. Stated differently, the meaning meant by the statement does not align with its literal interpretation. When someone uses exaggeration, they state something is more than X instead of just saying X. By employing hyperbole, they go beyond what the listeners anticipate. According to some academics, people often utilize exaggeration in their daily talks as a way to exaggerate and

assess. Greek handbooks noted hyperbole, and it has been employed for thousands of years. In fact, Quintilian, the Roman Rhetorician, discusses hyperbole and claims that people employ it on a daily basis, including illiterate people and peasants. In saying that people without education often employ exaggeration, he may be pointing out how simple it is to create and understand exaggeration. Even though people utilize hyperbole all the time, not much is known about it.

The research has shown that to describe the event under study the politicians use rhetoric devices that exaggerate its social and political importance. In political discour se hyperboles have an impact on thr ee modes of persuasion – logos, pathos and ethos, but in political communication the effectiveness of a hyperbole as a persuasion tool mainly depends on ethos, i.e. conditions of a speech act which determine the relevance of this rhetor ical device and a speaker's personality. In some statements hyperboles are so efficiently embedded the communicative context that they are interpreted literally. In political discourse persuasion is often implemented through the use of hyperboles and other rhetorical devices (analogy, alliteration, anaph ora, climax). The evocative character of hyperbole is key to the implementation of its persuasive function in political discourse. Under the influence of the representations evoked by hyperbole, the object of exaggerated description acquires characteristics which quantitatively and, in some cases, qualitatively differ from its real properties.

The research has shown that to describe the event under study the politicians use rhetoric devices that exaggerate its social and political importance. In political discourse hyperboles have an impact on three modes of persuasion – logos, pathos and ethos, but in political communication the effectiveness of a hyperbole as a persuasion tool mainly depends on ethos, i.e. conditions of a speech act which determine the relevance of this rhetor ical device and a speaker's personality. In some statements hyperboles are so efficiently embedded the communicative context that they are interpreted literally. In political discourse persuasion is often implemented through the use of hyperboles and other rhetorical devices (analogy, alliteration, anaph ora, climax). The evocative character of hyperbole is key to the implementation of its persuasive function in political discourse. Under the influence of the representations evoked by hyperbole, the object of exaggerated description acquires characteristics which quantitatively and, in some cases, qualitatively differ from its real properties (Clark, 1996).

Studies show that politicians use rhetorical devices to exaggerate the social and political relevance of the event they are portraying. In political discourse, hyperboles impact the three main persuasive modalities: pathos, ethos, and logos. However, in political communication, ethos – the conditions of a speech act that establish the speaker's character and the significance of this rhetorical device – largely determines how effective exaggeration is as a persuasion tactic. In certain statements, exaggerations are so deftly woven into the narrative that they are interpreted as fact. In political discourse, devices like anaphora, climax, alliteration, and hyperboles are commonly used as persuasive devices. The emotive aspect of hyperbole plays a major role in its persuasiveness in political speech. Depending on the representations sparked by the use of hyperbole, the object of exaggerated description takes on features that diverge from its genuine attributes, both qualitatively and statistically (Ball, 1970).

**Analysis.** For ages, linguists, philosophers, and literary experts have been actively studying hyperbole. Nonetheless, the majority of study in this field concentrated on identifying its linguistic status, creating kinds classifications, explaining the lexical and grammatical processes involved in its production, and conducting a comparative examination of the usage of exaggeration in other languages. Psycholinguistic and cognitive linguistics researchers have made significant contributions to the study of hyperbole.

The focus has mainly been on characterizing and categorizing the trope of hyperbole, even though it has been one of the several figures of speech examined within the broad framework of rhetoric since antiquity. Hyperbole has received very little attention in modern language research, mostly because it is seen in other fields as a traditional device whose analysis falls under the purview of rhetoric. The study of hyperbole in the fields of linguistics, psychology, philosophy, and

literary criticism has hitherto received little or no serious consideration. Comparing exaggeration's frequency and use across cultural contexts has been a major focus of empirical research on the topic. In an effort to provide a preliminary contribution to the fields of political discourse analysis and figurative language, this study focuses on the idea of hyperbole in political speeches. Overstatement and exaggeration will be equated with hyperbole throughout the study.

With roots in Aristotle, the term "hyperbole" is well-known and frequently appears in rhetorical histories. According to Smith's Mysterie of Rhetorique Unvaild, for instance, hyperbole occurs when a trope is excessively expanded, when there is a very high and lofty shift in meaning, or when someone argues far more in favor of or against something than is accurate – above and beyond belief. Auxesis and meiosis, which refer to the extreme intensification, expansion, or enlargement of a thing and the exaggerated reduction or attenuation of it, respectively, are recognized as two types of hyperbole. These definitional components are still relevant today. Using examples from written sources, Ravazzoli suggests several linguistic forms of exaggerated language, such as those that expand/magnify and those that attenuate (metaforica amplificante and metaforica attenuativa), in statements like calling someone a colossus or a little pipsqueak, respectively, and simile and metonymy forms (X is like a thunderbolt and Y is all arms and legs). Although the categorizations make sense intuitively, there are issues with the overlaps with metonymy, metaphor, and simile, which attenuate it, accordingly (Kaplan, 1995: 358-362).

Several metaphors and other figures of speech, such as hyperboles, have been so conventionalized or even deemed "dead" that they are no longer considered hyperbole in the sense of deliberate exaggeration within a particular context and with a certain assessment objective. Given how frequently and conventionally the phrase "for ages" is used, saying "I haven't seen someone in ages" may not typically carry an excessive amount of force – it just means "for a long time." Similarly, even though a verb like "be dying to" (e.g., "die to meet someone") is counterfactual when taken literally, it can not be perceived as overdone or exaggerated at all.

The specific context will always be the deciding element, but the test of impossibility or counterfactuality will be very helpful in handling the enormous number of utterances in the current study. As an example, comparing the milliseconds needed by one's brand-new, state-of-the-art computer to the two seconds required by one's two-year-old computer to complete a task (the old one taking ages to save a document) is one instance where it may be true that the term "ages" can be used hyperbolically. In the current study, a vast number of utterances will benefit greatly from the test of impossibility or counterfactuality; however, the specific context will always be the determining element. Indeed, there are situations in which the term "ages" can be used exaggeratedly. For example, comparing the milliseconds it takes one's brand-new, state-of-the-art computer to accomplish a task that took one's two-year-old computer two whole seconds to complete – the old machine took ages to save a document (Kaplan, 1995: 358-362).

When an expression is overly dramatic compared to its ontological referent, it is called hyperbole. To put it another way, they propose that there are three key components that will enable us to define hyperbole. Exaggeration is the first. The second is the significance of the change in meaning from the propositional to the speaker's intended meaning. Lastly, while speaking hyperbolically, a particular referent needs to be provided. We'll go over each of those components one by one, beginning with exaggeration. Overstretching is the initial component of hyperbole. A speaker who uses hyperbole is highlighting a certain aspect or quality. Speakers who exaggerate typically do so to highlight a point or highlight how important something is. Hyperbole employs false claims to emphasize the significance and difficulty of the topic at hand. We'll use the following example to demonstrate:

*This is the worst thing that happened in 2015!*

When said, the speaker is emphasizing a point he is making by expressing something false. To emphasize his sentiment that what happened was terrible, he is making up a story about the *"worst thing that happened in 2015"*.

